# HİCAB
# NECƏ VƏ NƏ ÜÇÜN!

Doktor Əliəsgər Rizvani



Tərcümə etdi:
Camaləddin Şükürov

# !HİCAB NECƏ VƏ NƏ ÜÇÜN


:Müəllif

Doktor Əliəsğər Rizvani



:Çap nəşriyyat

əl–Mustafa (s) Beynəlxalq Tərcümə və Nəşr mərkəzi

:Digital nəşriyyat

İsfəhan Qaimiyyə adına komputer araşdırmalar mərkəzi

# Mündəricat

## !HİCAB NECƏ VƏ NƏ ÜÇÜN

### KİTAB HAQQINDA

!KITABıN ADı: HICAB NECə Və Nə üçüN

MüəLLIF: Doktor Əliəsğər Rizvani

TəRCüMə EDəN: Cəmaləddin Şükürov

REDAKTOR: Tofiq Əsədov

KOMPYUTERDə YığAN: Ələddin Məlikov

KORREKTOR: Seyid Möhsin İmadi Məcd

NAşIR: Beynəlxalq əl-Müstəfa(s) Nəşr və tərcümə Mərkəzi

ÇAP TARIXI: ۲۰۱۰

ÇAP NöVBəSI: Birinci

TIRAJ: ۱۰۰۰



:İNVAN

İran, Qum, Şühəda meydanı, Höccətiyyə prospekti, Höccətiyyə mədrəsəsinin qarşısı, Beynəlxalq əl-Mustəfa (s) Universitetinin nəşriyyatı. TEL/FAKS: +۹۸ ۲۵۱ ۷۷۳۰۵۱۷

İran, Qum, Mühəmməd Əmin prospekti, Elmlər Universitetinin nəzdi, Beynəlxalq əl-Mustəfa (s) Universitetinin nəşriyyatı. TEL/FAKS: +۹۸۲۵۱ ۲۱۳۳۱۰۶ / +۹۸۲۵۱ ۲۱۳۳۱۴۶

www.miup.ir , www.eshop.miup.ir

E-mail: admin@miup.ir, root@miup.ir

## ÖN SÖZ

Şərq və qərb dünyasının ən böyük problemi insani dəyərləri qorumaq məqsədilə səmavi şəriətlərin tövsiyə etdiyi məhdudiyyətin aradan getməsidir. Qərb sivilzasiyası İslam məmləkətlərinə açıldığı gündən bəri hökumətlər cəmiyyətdə qərbli qadının örnəyini təbliğ etməyə çalışır. Göz və bədənlərin hicabını aradan qaldırıb, gözləri və .bədənləri çirkləndirməklə qəlblərin aynasını rəzilətlərlə bulaşdırmışlar

Bu böyük dəyərə xəyanət edənlər cəmiyyətdə özlərini islahatçı kimi tanıtdırır və iddia edirlər ki, hicab və örpək vasitəsilə qadınlara əsrlər boyu zülm edilmiş, insani hüquqları tapdanmış, elm və incəsənət karvanından geridə qalmışlar. Hicab onları ərlərin, ataların və qardaşların əsarəti altında kölə kimi işləmiş, azadlıq kimi böyük nemətdən məhrum etmişlər. İndi isə bu qədər məhrumiyyət və qadağanların əvəzini vermək, bütün ayrıseçkilik və məzlumiyyəti aradan qaldırmaq üçün

yalnız bir yol vardır. O da hicabı büküb bir kənara qoyub, açıq-saçıqlıq mədəniyyətini .genişləndirməkdir

Bu gün bu həqiqəti aydınlaşdırmaq lazımdır ki, qadının şəxsiyyəti, məqam və mənzilləti .açıq-saçıqlıq və laqeydlikdə yox, əksinə hicabda qoyulmuşdur

Qadın müqəddəs İslam hicabını geyinməklə hansısa bir şeyi əldən vermir, üstəlik həm .özünü, həm də cəmiyyətini onun qiymətli faydaları ilə bəhrələndirir

Əgər qadın hicabını götürsə, bir çox əxlaqi dəyərləri itiricək və bununla da, ailə ocaqları dağılacaq və cəmiyyət fitnə-fəsada çəkiləcəkdir. Lakin hicabını qoruduqda isə, öz dəyərini yüksəldəcək, ailə ocaqları möhkəmlənəcək və nəhayət, icəmiyətə sağlamlıq .və paklıq hakim kəsiləcəkdir

Qərb dünyası qadından hicabı almaqla nəinki sağlamlığını, səadət və xoşbəxtliyini .təmin etməmiş, həqiqətdə, hər bir şeyini əlindən almışdır

Hicab nə manedir, nə də əzab-əziyyət; bu kimi kateqoriyanı bəhanə edərək açıq-saçıqlıq və yarımçılpaqlığa üz gətirmək bu yüksək dəyərə zülm və dini-əxlaqi dəyərləri məhv etməklə, cövhər və azadlığımızı əlimizdən almaq istəyən istismarçılara .köməkdir

İndi isə, biz bu yüksək dəyərin möhkəmləndirilməsi uğrunda əlimizdən gələni əsirgəməməli və qəflətdə yatanları başa salmalıyıq ki, hicab məhdudiyyət, nöqsan və .eyib deyil, əksinə bir çox faydalar və müsbət təsirlərlə yanaşı, pak və müqəddəsdir

## MÜNDƏRİCAT

səh:۷

### TƏKVİN VƏ TƏŞRİ ALƏMİNDƏ ƏDALƏT

١. Mücərrəd, maddi, mələkut, bəsit və mürəkkəb varlıqlardan ibarət olan yaradılış aləminə yeganə nizam-intizam hakim kəsilmiş, ilahi tövhid, möhkəm qanunlar və böyük bina üzərində qurulmuş və bütün tərkib hissələri son dərəcədə möhkəmliklə bir-birinə bağlanmışdır.

Mütəal Allah buyurur:

صُنْعَ اللهِ الَّذِی أَتْقَنَ كُلَّ شَیْءٍ إِنَّهُ خَبِیرٌ بِمَا تَفْعَلُونَ

“Bu (yaradılış), Allahın hər şeyi möhkəmliklə (yerli-yerində) gördüyü işdir!”(١)

٢. Allah-taala insanı yaratdıqdan sonra onu özbaşına buraxmadı, əksinə müxtəlif bacarıqlar, keyfiyyətlər və xüsusiyyətlərlə yanaşı olan xilqətinin başlanğıcından sonuna qədər onunla birgə olmuş, göstəriş və buyruqları ilə onu səadət və təkamül



---

[١]-١ “Nəml” surəsi, ayə: ٨٨.

.yoluna də`vət etmişdir

:Allah-taala Öz vəsfində belə buyurur

الَّذِی خَلَقَ فَسَوَّی. وَالَّذِی قَدَّرَ فَهَدَی

O Rəbbin ki, (hər şeyi) xəlq etdi və nizama saldı. O Rəbbin ki, (hər şeyin keyfiyyətini,“ (xüsusiyyətini, davam müddətini) əzəldən müəyyən etdi və (hamıya) yol göstərdi.”(١)

Allah-taala hər bir şeyin haqqını layiqincə vermişdir. Çünki insanları haqq-ədalətə .٣ :də`vət edərək buyurmuşdur

إِنَّ اللهَ يَأْمُرُ بِالْعَدْلِ

(Həqiqətən, Allah ədalətli olmağı əmr edir!”(٢“

:Başqa bir ayədə buyurulur

وَ أَنَّ اللهَ لَيْسَ بِظَلَّامٍ لِّلْعَبِيدِ

(Həqiqətən, Allah bəndələrinə əsla zülm edən deyildir!”(٣“

.Ədalət odur ki, haqq sahibinə haqqı layiqincə, ifrat və təfrit olmadan verilsin

:Yenə başqa bir ayədə buyurulur

لاَ يُكَلِّفُ اللهُ نَفْسًا إِلاَّ وُسْعَهَا

(Allah hər kəsi yalnız qüvvəsi yetdiyi qədər mükəlləf edər!”(٤“

Əgər qadınlara qəzavət, mühakimə, idarəçilik, cihad, zəruri olmadığı zaman ictimai işlərdə iştirak



---

.Ə`la” surəsi, ayə: ٢-٣“ [١]-١

.Nəhl” surəsi, ayə: ٩٠“ [٢]-٢

.Ali-İmran” surəsi, ayə: ١٨٢“ [٣]-٣

etmək, açıq-saçıqlıq kimi bir sıra işlərin qadağan olduğunu müşahidə ediriksə, bu onların hüquqlarını mənimsəmək deyil, əksinə onlara haqqı tamamilə əta etməkdir. Çünki mütəal Allah qadınları elə lətif xüsusiyyətlər və instinktual hisslərlə birgə yaratmışdır ki, bu işlər onlara mütənasib deyildir!

۴. Aydındır ki, qadınla kişi zahir və batin, cisim və ruh, xilqət və rəftar, fikir və şəfqət kimi müxtəlif cəhətlərdə bir-birindən fərqlənir ki, varlıq aləminə hakim nizam-intizam onun əsasında hərəkət etsin.

Allah-taala buyurur:

وَإِن مِّن شَيْءٍ إِلاَّ عِندَنَا خَزَائِنُهُ وَمَا نُنَزِّلُهُ إِلاَّ بِقَدَرٍ مَّعْلُومٍ

“(Yerdə və göydə) elə bir şey yoxdur ki, onun xəzinələri Bizdə olmasın. Lakin Biz ondan ancaq müəyyən qədər endiririk.”(۱)

۵. Bizim etiqadımıza görə, bəşərin təklifi işləri zatən yaxşılıq və pislik xarakteri daşıyır və əql onların hansının yaxşı və pis olduğunu ayırd edə bilir. Örpəkli və ya açıq-saçıqlıq da insanın digər əməlləri kimi, həmin xarakterə malikdir. Məhz bu səbəbdən, örpək bir növ dəyər, açıq-saçıqlıq isə dəyərə əks bir əməldir. Bizim vəzifəmiz isə dəyərləri qorumaq, ona əks olanları aradan qaldırmaqdır.



---

۱- [۱] “Hicr” surəsi, ayə: ۲۱.

## KİŞİLƏRLƏ QADINLARIN MÜŞTƏRƏK CƏHƏTLƏRİ

### İşarə

Qurani-Kərimə müraciət etdikdə, kişi və qadının müxtəlif cəhətlərdə bir-birilə müştərək və bərabər olduğunu görürük. Bu cəhətlər onların dəyər və qiymətini bildirir ki, onların bir neçəsini qeyd etməklə kifayətlənirik:

### ۱. Kişi və qadının yaxşı əməlləri qazanması:

Kişi və qadın yaxşı və xeyirli əməllər kəsb etməkdə bir-birilə bərabərdir. Belə ki, Allah-taala buyurur:

للرِّجَالِ نَصِيبٌ مِّمَّا اكْتَسَبُواْ وَلِلنِّسَاء نَصِيبٌ مِّمَّا اكْتَسَبْنَ...

“Kişilərin öz qazandıqlarından öz payı, qadınların da öz qazandıqlarından öz payı vardır. (Onların heç birinin hüquqları tapdanmır.)”(۱)



---

۱- [۱] “Nisa” surəsi, ayə: ۳۲.

**:İnsanın digər məxluqlardan kəramət və üstünlüyü .٢**

İnsan ـ istər kişi olsun, istərsə də qadın – Mütəal Allahın digər məxluqlarından üstün, :şərəfli və fəzilətlidir. Allah-taala buyurur

وَلَقَدْ كَرَّمْنَا بَنِی آدَمَ وَحَمَلْنَاهُمْ فِی الْبَرِّ وَالْبَحْرِ وَرَزَقْنَاهُم مِّنَ الطَّيِّبَاتِ وَفَضَّلْنَاهُمْ عَلَى كَثِيرٍ مِّمَّنْ خَلَقْنَا تَفْضِيلاً

Biz, Adəm övladını şərəfli və hörmətli elədik, onları suda və quruda (minik və nəqliyyat“ vasitələrinə) mindirib sahib etdik, özlərinə (cürbəcür nemətlərdən) təmiz ruzi verdik və (onları yaratdığımız məxluqatın çoxundan xeyli üstün etdik.”(١

İnsan şüur, nitq qabiliyyəti, gözəl surət, boy-buxun, və s. bu kimi məziyyətlərinə görə,) (!həmişə Allaha şükür edib, yalnız Ona itaət etməli, Rəbbinə heç bir şərik qoşmamalıdır

**:Ruhun üfürülməsi .٣**

Həm kişi, həm də qadının ruhu Allah tərəfindən üfürülmüşdür. Allah-taala bu haqda :buyurur

ثُمَّ جَعَلَ نَسْلَهُ مِن سُلَالَةٍ مِّن مَّاء مَّهِينٍ. ثُمَّ سَوَّاهُ وَنَفَخَ فِيهِ مِن رُّوحِهِ...

Sonra onun nəslini nütfədən ـ bir qətrə zəif (dəyərsiz) sudan əmələ gətirdi. Sonra onu“ ((qamətini) düzəldib insan şəklinə saldı və ona öz ruhundan üfürdü...”(٢



---

.İsra” surəsi, ayə: ٧٠“ [١]-١

.Səcdə” surəsi, ayə: ٨-٩“ [٢]-٢

### :İnsan yaradılışına təbrik demək .۴

:Mütəal Allah kişi və qadının xilqətinə təbrik demişdir. Belə ki, Qurani-Kərimdə buyurur

ثُمَّ خَلَقْنَا النُّطْفَهَ عَلَقَهً فَخَلَقْنَا الْعَلَقَهَ مُضْغَهً فَخَلَقْنَا الْمُضْغَهَ عِظَامًا فَكَسَوْنَا الْعِظَامَ لَحْمًا ثُمَّ أَنشَأْنَاهُ خَلْقًا آخَرَ فَتَبَارَكَ اللهُ أَحْسَنُ الْخَالِقِينَ.

Sonra nütfəni laxtalanmış qana çevirdik, sonra laxtalanmış qanı bir parça ət etdik,“ sonra o bir parça əti sümüklərə döndərdik, sonra sümükləri ətlə örtdük və daha sonra onu bambaşqa (yeni) bir məxluqat olaraq yaratdıq. Yaradanların ən gözəli olan Allah (nə qədər (uca, nə qədər) uludur!”(۱)

### :Təqva və pərhizkarlıq .۵

Kişi və qadın təqva və pərhizkarlıq yolunu bərabər səviyyədə keçə bilərlər. Allah-taala :bu haqda buyurur

يَا أَيُّهَا النَّاسُ إِنَّا خَلَقْنَاكُم مِّن ذَكَرٍ وَأُنثَى وَجَعَلْنَاكُمْ شُعُوبًا وَقَبَائِلَ لِتَعَارَفُوا إِنَّ أَكْرَمَكُمْ عِندَ اللهِ أَتْقَاكُمْ إِنَّ اللهَ عَلِيمٌ خَبِيرٌ

Ey insanlar! Biz sizi bir kişi və bir qadından (Adəm və Həvvadan) yaratdıq. Sonra bir-“ birinizi tanıyasınız deyə, sizi xalqlara və qəbilələrə ayırdıq. Allah yanında ən hörmətli olanınız ən təqvalınızdır (Allahdan ən çox qorxanınızdır). Həqiqətən, Allah (hər şeyi) (biləndir, (hər şeydən) xəbərdardır.”(۲)



---

.Muminun” surəsi, ayə: ۱۴“ [۱] -۱

.Hücurat” surəsi, ayə: ۱۳“ [۲] -۲

### :İnsanın əməllərinin puç olmaması .۶

Allah-taala heç bir kişi və qadının əməlini puç etməyəcəkdir. Öz kəlamında bu haqda :buyurur

...أَنِّی لاَ أُضِیعُ عَمَلَ عَامِلٍ مِّنکُم مِّن ذَکَرٍ أَوْ أُنثَی...

(İstər kişi, istərsə də qadın olsun, Mən heç birinizin əməlini puça çıxarmaram..." (۱)..."

### :İlahi məğfirət və mükafata nail olmaq .۷

Kişi və qadın Allahın məğfirəti və mükafatına nail olmaqda bərabərdir.Qurani-Kərimdə :bu haqda buyurulur

إِنَّ الْمُسْلِمِینَ وَالْمُسْلِمَاتِ وَالْمُؤْمِنِینَ وَالْمُؤْمِنَاتِ وَالْقَانِتِینَ وَالْقَانِتَاتِ وَالصَّادِقِینَ وَالصَّادِقَاتِ وَالصَّابِرِینَ وَالصَّابِرَاتِ وَالْخَاشِعِینَ وَالْخَاشِعَاتِ وَالْمُتَصَدِّقِینَ وَالْمُتَصَدِّقَاتِ وَالصَّائِمِینَ وَالصَّائِمَاتِ وَالْحَافِظِینَ فُرُوجَهُمْ وَالْحَافِظَاتِ وَالذَّاکِرِینَ اللهَ کَثِیرًا وَالذَّاکِرَاتِ أَعَدَّ اللهُ لَهُم مَّغْفِرَةً وَأَجْرًا عَظِیمًا

Həqiqətən, Allah məhz müsəlman kişilər və qadınlar, mömin kişilər və qadınlar," (Allaha) müti kişilər və qadınlar, doğru danışan kişilər və qadınlar, səbirli kişilər və qadınlar, təvazökar (yalnız Allah qarşısında kiçilən) kişilər və qadınlar, sədəqə verən, oruc tutan kişilər və qadınlar, ayıb (övrət) yerlərini (zinadan) qoruyub saxlayan kişilər və qadınlar və Allaha çox zikr edən kişilər və qadınlar üçün (axirətdə) məğfirət ((bağışlanma) və böyük bir mükafat (Cənnət) hazırlamışdır!"(۲)

:Həmçinin buyurulur

وَمَن یَعْمَلْ مِنَ الصَّالِحَاتَ مِن ذَکَرٍ أَوْ أُنثَی وَهُوَ مُؤْمِنٌ فَأُوْلَئِکَ یَدْخُلُونَ



---

.Ali-İmran" surəsi, ayə: ۱۹۵" [۱] -۱

.Əhzab" surəsi, ayə: ۳۵" [۲] -۲

الْجَنَّةَ وَلاَ يُظْلَمُونَ نَقِيرًا

Mömin olmaqla bərabər, yaxşı işlər görən kişilər və qadınlar Cənnətə daxil olarlar.“ (Onlara xurma çəyirdəyi qədər haqsızlıq edilməz!”(١)

:Yenə başqa bir ayədə buyurulur

مَنْ عَمِلَ صَالِحًا مِّن ذَكَرٍ أَوْ أُنثَى وَهُوَ مُؤْمِنٌ فَلَنُحْيِيَنَّهُ حَيَاةً طَيِّبَةً وَلَنَجْزِيَنَّهُمْ أَجْرَهُم بِأَحْسَنِ مَا كَانُواْ يَعْمَلُونَ

Mömin olub yaxşı işlər görən (Allaha itaət edən) kişi və qadına (dünyada və axirətdə)“ (xoş həyat nəsib edəcək və etdikləri yaxşı əməllərə görə mükafatlarını verəcəyik.”(٢)

**:Hidayət səciyyəsi .٨**

Qurani-Kərimin ayələrindən başa düşülür ki, insanın fitrətində əmanət qoyulan hidayət səciyyəsi yalnız kişilərə xass deyil, qadınlara da aiddir. Allah-taala bu haqda :buyurur

إِنَّا هَدَيْنَاهُ السَّبِيلَ إِمَّا شَاكِرًا وَإِمَّا كَفُورًا

(Biz ona haqq yolu göstərdik. İstər (nemətlərimizə) minnətdar olsun, istər nankor.”(٣“

:Başqa bir ayədə buyurur

وَنَفْسٍ وَمَا سَوَّاهَا. فَأَلْهَمَهَا فُجُورَهَا وَتَقْوَاهَا.

And olsun nəfsə və onu yaradana. Sonra da ona günahlarını və pis əməllərdən“ çəkinməsini (xeyir və



---

.Nisa” surəsi, ayə: ١٢۴“ [١] -١

.Nəhl” surəsi, ayə: ٩٧“ [٢] -٢

.İnsan” surəsi, ayə: ٢“ [٣] -٣

(şəri) öyrədənə!”(1)

**:Elm öyrənmək .9**

Kişi və qadın elm öyrənməyə maraq göstərir. Belə ki, Allah-taala Qurani-Kərimdə :buyurur

الرَّحْمَنُ. عَلَّمَ الْقُرْآنَ. خَلَقَ الْإِنسَانَ. عَلَّمَهُ الْبَيَانَ.

Rəhman (Mərhəmətli Allah), (Öz peyğəmbərinə) Quranı öyrətdi. İnsanı yaratdı. Ona“ (danışmağı (bəyanı) öyrətdi.”(2)

:Başqa bir ayədə isə belə buyurur

اقْرَأْ وَرَبُّكَ الْأَكْرَمُ. الَّذِى عَلَّمَ بِالْقَلَمِ. عَلَّمَ الْإِنسَانَ مَا لَمْ يَعْلَمْ.

Ya Peyğəmbər!) Oxu! Sənin Rəbbin ən böyük kərəm sahibidir! O Rəbbin ki, qələmlə )“ ((yazmağı) öyrətdi. (O Rəbbin ki) insana bilmədiklərini öyrətdi.”(3)

**:İlahi əmanəti qəbul etmək .10**

:Kişi və qadın ilahi əmanəti qəbul etməkdə bir-birilə şərikdir. Mütəal Allah buyurur

إِنَّا عَرَضْنَا الْأَمَانَةَ عَلَى السَّمَاوَاتِ وَالْأَرْضِ وَالْجِبَالِ فَأَبَيْنَ أَن يَحْمِلْنَهَا وَأَشْفَقْنَ مِنْهَا وَحَمَلَهَا الْإِنسَانُ...

Biz əmanəti (Allaha itaət və ibadəti, şəri hökmləri yerinə yetirməyi) göylərə, yerə və“ dağlara təklif etdik. Onlar onu yüklənməkdən (götürüb özləri ilə



---

.Şəms” surəsi, ayə: 7-8“ [1] -1

.Ər-rəhman” surəsi, ayə: 1-4“ [2] -2

.Ələq” surəsi, ayə: 3-5“ [3] -3

(daşımaqdan) qorxub çəkindilər. Ona insan yükləndi...”(١)



---

١- [١] “Əhzab” surəsi, ayə: ٧٢.

## KİŞİLƏRLƏ QADINLARIN FƏRQİ

**İşarə**

:Qadınla kişi arasında bir sıra fərqlər vardır

**:Xeyir və şərin, mənfəət və zərərin ayırd edilməsi .۱**

Tə`yin və ayırdetmə qüdrəti insanlar arasında bərabər şəkildə mövcud olan əsaslı məsələlərdən olsa da, onların cüzi və dəqiq işlərdə ayırdetmə qüdrəti bir-birlərindən .fərqlənir

Kişinin quruluş və şəxsiyyəti öhdəsinə götürdüyü vəzifələri nəzərə alaraq qadının quruluş və şəxsiyyətindən üstündür; hərçənd bu, bə`zi qadınların bə`zi kişilərdən .üstün və fəzilətli olmasına mane deyildir

**:Əql qüvvəsindən bəhrələnmək .۲**

Qadın fitri baxımdan şəfqəti hislərə daha çox malik olduğu üçün əqli yollara möhkəm qapılmadan, şəriət qanunları ilə tətbiq etmədən və hikmət tərəzəsində

ölçüb-biçmədən meyl və istəklərinə doğru sür`ətlə hərəkət edir. Məhz bu səbəbdən, .onun qəlbi əql səsinə təslim olmaqdan daha çox şəhvət və ehtiraslara yönəlir

Buna əks olaraq kişilər isə uzaqgörənlikləri və düşüncələri ilə qadınlardan tamamilə fərqlənirlər. Qadınlar ən kiçik qəfil işlər müqabilində sür`ətlə tə`sirlənir, möhnət və çətinliklərdə iradəsiz görünürlər. Onlar düçar olduqları çətinlikdən qurtulmaq üçün əql qüvvəsinə söykənmək əvəzində ah-nalə edib, ağlamağa başlayırlar. Buna görə də .mütəal Allah iki qadının şahidliyini bir kişinin şahidliyi ilə bir səviyyədə yerləşdirmişdir

**:Əql və zəkanın növləri .۳**

Yeni psixologiya elminə əsasən, kişi ilə qadın cinsinin ümumi zəkası bir-birilə bərabər .olduğu halda, əqli baxımdan onların arasında əsaslı fərq mövcuddur

Bəzilərinin mülahizələrinə görə, əql iki qismə bölünür: bir qismi qoruyucu, digər bir qismi isə ixtira rolunu ifa edir. Belə ki, əqlin ixtira qüvvəsi hər bir şeyi qoruyucu qüvvədən alaraq onu icad və kəşf edir. Qadının əql təbiəti daha çox qoruyucu qüvvəyə meylli olduğu halda, kişilərin əql təbiəti ixtira və kəşf qüvvəsinə daha yaxındır. Zəkaya gəldikdə isə, qadınlar biliklərini qorumaqda daha çox qüdrətə malikdirlər, halbuki .kişilər təfəkkür qüvvəsinin vasitəsilə ixtira və kəşfdə qadınlardan üstündürlər

Kişinin kəşf və ixtira təbiəti şöhrət və camaatın onun haqda baxışlarına əhəmiyyət vermədən əxlaq və ideologiyalarla zinətlənməkdə, həyatında yeni hikmətlərdən bəhrələnməkdə, nəzəri biliklərin kəşfinə doğru həkərətdə təcəlla olur. Qadınlar isə belə deyildir. Odur ki, deyirlər: "Sivilzasiya qadınların yox, kişilərin ixtirasıdır".

**۴. Əqlin yüksəlişi:**

Əgər kişilər yetkinlik həddinə qadınlardan gec çatırlarsa, bunun səbəbi onların geniş fəaliyyətlər nəticəsində yüksəlişə doğru addımlamaları ilə əlaqədardır.

**۵. Əqlin şəfqətə üstünlüyü:**

İnsanın ruhu əql və şəfqətdən təşkil olsa da, Allah-taala kişinin əqlini şəfqətinə, qadının isə şəfqətini əqlinə üstünlük vermişdir. Bunun səbəbi onların hər birinin həyat tərzi ilə uyğunluğudur. Bu fərq onların bir-birinə ülfət və bağlılığı üçün zəruridir.

Psixioloqların nəzəriyyələrinə görə, qızlar pak şəfqət və incə hisslərə malik olduğundan oğlanlara nisbətən daha tez islahat proqramlarından tə`sirlənir və və onlardan tez yeriməyə başlayırlar.

Muris Debsin yazdığına əsasən, qızlar, xüsusilə gələcək analıq və ailəvi hisslərini nəzərə alaraq özünütərbiyədə cavan oğlanların tərbiyəsindən azacıq fərqlənirlər.(۱)



---

۱- [۱] "Dünyaye nocəvaniye doxtəran", Doktor Əli Qaimi, səh. ۳۸۶.

Analıq hissi qadının şəfqətinin inkişafında xüsusi əhəmiyyət kəsb edir və bu səbəbdən psixoloqlar bu hissi qadınların bir çox psixi-şəfqəti hallarının əsası və onların varlığının .ayrılmaz bir hissəsi hesab edirlər

**:Ruhi–psixi gərginliklər .۶**

Psixologiya elmində kişi ilə qadın ruhiyyələri arasında aşkar fərqlər bəyan edilmişdir. Tədqiqatlardan bəlli olur ki, kişinin ruhiyyəsi təsiredici xarakter daşıyır və fəaldır, halbuki qadının ruhiyyəsi hər bir şeydən tə`sirlənir. Bu da kişinin təcavüz və özünün başqalarına üstünlüyünü göstərir. Necə ki, "qadının həyata meyli onun himayə və .səadətini tə`min edən kişinin sayəsindədir!" – fikrini də açıqlayır

**:Qayğı və ülfət .۷**

Qadın şəfqət, ülfət, mehribanlıq, həssasiyyət və tə`sirlənmə baxımından kişi ilə fərqlənir. O, səbir və dözümə ehtiyac duyduğu kimi, kişi də uzaqgörənlik, iradə, şücaət və müqavimətlə seçilir. Ailə ehtiyaclarını tə`min və himayə edən bu xüsusiyyət və vəzifələr kişinin təbiətinə uyğun verildiyi kimi, qadının da vəzifəsi paklıq, gözəllik, ülfət, .qayğı və tərbiyəni sevməkdir

**:Şöhrət və zahirpərəstlik .۸**

Qadın yüksək elmi nailiyyətlərə yiyələnsə də, kişi ilə

müqayisədə öz zahiri görünüşünə daha çox fikir verir. Halbuki, kişi ən çox öz həqiqəti və varlıq gövhərinə əhəmiyyət verir. Mütəal Allah bu xüsusiyyəti qadına vermişdir ki, .kişinin diqqətini özünə cəlb edə bilsin

Kişi ilə qadın arasındakı fərqlər haqda deyilənlər onların növünə aid idi; hərçənd, .onların arasında elələri də ola bilər ki, deyilən fərqlərə malik olmasın

## QADINLARA TÖVSİYƏ

### İşarə

İslam tə`limlərinə diqqət yetirdikdə, qadınlara hədsiz dərəcədə tövsiyələr verildiyinin şahidi oluruq:

### 1. Qızlar öndədirlər:

Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur:

من دخل السوق فاشترى تحفه فحملها الى عياله ... و لبيدأ بالإناث...

“Bazara gedən şəxs hədiyyə alıb evinə aparsa, onu bölərkən qızlardan başlasın.”(1)

Həmçinin buyurmuşdur:

ساووا بين اولادكم فى العطيه، فلو كنت مفضّلاً لفضّلت النّساء.

“Övladlarınızla bərabər davranın və əgər bir kəsə çoxlu bəxşiş vermək istəyirsənsə, qadınlara ver.”(2)



---

1- [1] “Vəsailüş-şiə”, 21-ci cild, səh. 514, “İstihbabu şirait-tühəful-liləyal” bölümü.

2- [2] Yenə orada.

**:Qızlara qayğı və mehribanlıq .۲**

:İmam Riza (ə) Peyğəmbəri-Əkrəmin (s) belə buyurduğunu nəql etmişdir

انّ الله تبارک و تعالی علی الاناث ارقّ منه علی الذّکور.

(Allah-taala qızlara oğlanlardan daha çox mehribandır."(۱"

**:Ananın haqqı atadan öndədir .۳**

:Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur

اذا کنت فی صلوه التطوّع، فان دعاک والداک فلا تقطعهما، و ان دعتک و الدتک فاقطعهما.

Müstəhəb namaz qıldığın zaman atan səni çağırsa, namazını kəsmə! Anan çağırdıqda"
(isə, namazını kəs (və ona cavab ver)!"(۲

:İmam Baqir (ə) həzrət Musa ibn İmrandan (ə) nəql edir ki, o, Allaha belə ərz etdi

یا رب اوصنی... قال: اوصیک بأمّک. قال: ربّ اوصنی. قال: اوصیک بأمّک. قال: ربّ اوصنی. قال: اوصیک بأمّک. قال: ربّ اوصنی. قال: اوصیک بأبیک. قال: لأجل دلک للأمّ ثلثی البرّ و للأب الثلث.

Ey mənim Rəbbim, mənə tövsiyə et!..." Allah-taala buyurdu: "Sənə ananı tövsiyə" edirəm." Yenə ərz etdi: "Ey mənim Rəbbim, mənə tövsiyə et!" Allah-taala buyurdu: "Sənə ananı tövsiyə edirəm." Yenə ərz etdi: "Ey mənim Rəbbim, mənə tövsiyə et!" Allah-taala buyurdu: "Sənə ananı



---

.Vəsailüş-şiə", ۲۱-ci cild, səh. ۳۶۷" [۱]-۱
.Müstədrəkül-vəsail", ۱۵-ci cild, səh. ۱۸۱" [۲]-۲

tövsiyə edirəm.” Yenə “Ey mənim Rəbbim, mənə tövsiyə et!” – deyə ərz etdikdə, Allah-taala buyurdu: “Sənə atanı tövsiyə edirəm!” İmam Baqir (ə) buyurdu: “Elə bu səbəbdən anaya yaxşılıq üçdə iki, ataya isə üçdə bir qədərdir.”(١)

### Cəbrailin qadınlara tövsiyəsi .۴:

Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur:

ما زال جبرائيل يوصينى بالمرئه حتّى ظننت انّه لا ينبغى طلاقها الاّ من فاحشه مبيّنه.

“Cəbrail qadını mənə o qədər tövsiyə etdi ki, onu aşkar çirkin işdən başqa zaman boşamağın düzgün olmadığını güman etdim!”(٢)

### Əhli–əyala yaxşılıq imanın üstünlüyünün me`yarı .۵:

Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur:

اقربكم منّى مجلساً يوم القيامه خيركم لأهله.

“Qiyamət günü məqam baxımından sizin mənə ən yaxın olanınız öz əhli-əyalına daha çox yaxşılıq edəninizdir.”(٣)

Həmçinin buyurmuşdur:

احسن النّاس ايماناً الطفهم بأهله و انا الطفكم بأهلى.

“İnsanların iman baxımından ən yaxşısı öz əhli-



---

١- [١] Yenə orada, ٢١-ci cild, səh. ۴٩٢, “İstihbabu ziyadətin fi birril-umm” bölümü.
٢- [٢] “Biharül-ənvar”, ١٠٣-cü cild, səh. ٢۵٣.
٣- [٣] “Vəsailüş-şiə”, ٨-ci cild, səh. ۵٠٧.

əyalına daha çox mehriban olanıdır. Mən sizdən öz əhli-əyalıma daha çox mehribanam.”(۱)

### ۶. Zövcələrlə mülayim davranmaq:

Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur:

و من صبر على خلق امرأه سيئه الخلق و احتسب فى ذلك الأجر، اعطاه الله ثواب الشّاكرين.

“(Allah dərgahında) Pis əxlaqlı qadının rəftarına səbr edib, onun mükafatını hesablayana Allah şükür edənlərin mükafatını verəcəkdir.”(۲)

### ۷. Zövcələrin meylini nəzərə almaq:

Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur:

المؤمن يأكل بشهوه اهله، و المنافق يأكل اهله بشهوته.

“Mö`min öz əhli-əyalının meyl və istəyi ilə, münafiqin əhli-əyalı isə onun meyl və istəyi ilə yemək yeyir.”(۳)

### ۸. Ev avadanlıqlarını zövcələrə tapşırmaq:

İmam Baqirdən (ə) belə nəql olunmuşdur:

دخل قوم على الحسين بن علىّ فقالوا: يا بن رسول الله! نرى فى منزلك اشياء نكرهها، و اذا فى منزله بسط و نمارق. فقال: انّنا نتزوّج النّساء فنعطيهنّ مهورهنّ فيشترين ماشئن ليس لنا منه شىء.

səh:۳۲

---

۱- [۱] Yenə orada, ۱۲-ci cild, səh. ۱۵۳, “İstihbabu husnul-xəlqi məən-nasi” bölümü.

۲- [۲] “Vəsailüş-şiə”, ۷-ci cild, səh. ۱۲۴.

۳- [۳] “Biharül-ənvar”, ۶۹-cu cild, səh. ۲۹۱.

Bir dəfə) bir qrup adam imam Hüseyn ibn Əlinin (ə) hüzuruna gedib dedilər: “Ey)“ Peyğəmbərin övladı! Evinizdə xoşlamadığımız avadanlıqlar görürük.” Bu bir halda ki, o həzrətin evində xalça və pərdələr var idi. Həzrət buyurdu: “Həqiqətən, biz qadınlarla evlənərkən onlara mehriyyələrini ödəyirik. Onlar da (həmin puldan) istədiklərini alırlar (və bunun bizə heç bir aidiyyatı yoxdur!”(١)

**:Qadınları sevmək .٩**

:İmam Sadiq (ə) buyurmuşdur

العبد كلّما ازداد للنّساء حبّاً ازداد فى الايمان فضلاً.

(Bəndənin zövcələrinə qarşı sevgisi artdıqca, imanı da fəzilətcə artacaqdır.”(٢)“

**:Qadınların vasitəsilə dinin təkmilləşməsi .١٠**

:Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur

من تزوّج احرز نصف دينه فليتق الله فى النّصف اللآخر.

Kim evlənsə, dininin yarısını qazanar. Belə isə, onun qalan yarısını ilahi təqva ilə kəsb“ (edin.”(٣)

**:Şəhidlərin mükafatının yarısı .١١**

:Bir rəvayətdə belə deyilir

جاء رجل الى رسول الله (ص) فقال: انّ لى زوجه اذا يخلت تلقّتنى



---

.Əl-kafi”, ۶-cı cild, səh. ۴٧۶“ [١] -١

.Vəsailüş-şiə”, ١۴-cü cild, səh. ١١“ [٢] -٢

.Kafi”, ۵-ci cild, səh. ٣٢٩“ [٣] -٣

و اذا خرجت شيّعتنى، و اذا رأتنى مهموماً قالت لى: ما يهمّك؟ ان كنت تهتمّ لرزقك تهتمّ لرزقك فقد تكفّل لک غيرک، و ان كنت تهتمّ لأمر آخرتک فزادک الله همّاً. فقال رسول الله(ص): انّ الله عمّالاً و هذه من عمّاله، لها نصف اجر الشّهيد

Bir dəfə) bir nəfər Peyğəmbəri-Əkrəmin (ə) hüzuruna gəlib dedi: “Mənim elə bir)“ həyat yoldaşım var ki, yanına gedəndə, pişvazıma çıxır və evdən çıxanda, mənim müşaiyət edir. Mənim qəmli gördükdə isə deyir: “Qəmli olmağına səbəb nədir? Əgər ruzinə görə qəm-qüssə yeyirsənsə, səndən başqası (Allah-taala) onu Öz öhdəsinə götürmüşdür və əgər axirətə görə qəm-qüssə yeyirsənsə, Allah-taala bu qəm-qüssəni daha da artırsın.” Peyğəmbəri-Əkrəm (s) buyurdu: “Həqiqətən, Allahın “amil”ləri var və bu qadın da Onun amillərindəndir. Ona şəhidin savabının yarısı (verilər.”(١)

**:Qadınları himayə etmək .١٢**

:Allah-taala Qur`ani-Kərimdə buyurur

يَا أَيُّهَا الَّذِينَ آمَنُواْ لاَ يَحِلُّ لَكُمْ أَن تَرِثُواْ النِّسَاء كَرْهًا وَلاَ تَعْضُلُوهُنَّ لِتَذْهَبُواْ بِبَعْضِ مَا آتَيْتُمُوهُنَّ إِلاَّ أَن يَأْتِينَ بِفَاحِشَةٍ مُّبَيِّنَةٍ وَعَاشِرُوهُنَّ بِالْمَعْرُوفِ فَإِن كَرِهْتُمُوهُنَّ فَعَسَى أَن تَكْرَهُواْ شَيْئًا وَيَجْعَلَ اللّهُ فِيهِ خَيْرًا كَثِيرًا.

Ey iman gətirənlər! Qadınlara zorla varis çıxmaq sizə halal deyildir! (Qadınlar) açıq-“ aşkar pis bir iş görməyincə, özlərinə verdiyiniz şeylərin (mehrin) bir



---

Əl-fəqih”, ٣-cü cild, səh. ٣٨٩, “Ma yustəhəbbu və yuhmədu min əxlaqin-nisai”“ [١] -١ .bölümü

hissəsini geri qaytarmaq məqsədilə onlara əziyyət verməyin. Onlarla gözəl (Allahın buyurduğu kimi) rəftar edin. Əgər onlara nifrət etsəniz (dərhal ayrılmaq qərarına gəlməyin). Ola bilsin ki, sizdə nifrət doğuran hər hansı bir şeydə Allah (sizdən ötrü) (çoxlu xeyir nəzərdə tutmuş olsun."(١)

:Həmçinin buyurur

وَلَن تَسْتَطِيعُواْ أَن تَعْدِلُواْ بَيْنَ النِّسَاء وَلَوْ حَرَصْتُمْ فَلاَ تَمِيلُواْ كُلَّ الْمَيْلِ فَتَذَرُوهَا كَالْمُعَلَّقَهِ وَإِن تُصْلِحُواْ وَتَتَّقُواْ فَإِنَّ اللهَ كَانَ غَفُورًا رَّحِيمًا.

Siz nə qədər çox istəsəniz də, heç vaxt arvadlar arasında ədalətlə rəftar etməyi" bacarmazsınız. Barı, (birisinə) tamamilə meyl göstərib, digərini asılı vəziyyətdə (nə ərli kimi ərli, nə də boşanmış kimi boşanmış) qoymayın. Əgər özünüzü islah edib (belə hərəkətlərdən) çəkinsəniz (Allah sizi bağışlar). Həqiqətən, Allah bağışlayandır, rəhm (edəndir!"(٢)

:Başqa bir ayədə belə buyurur

أَسْكِنُوهُنَّ مِنْ حَيْثُ سَكَنتُم مِّن وُجْدِكُمْ وَلَا تُضَارُّوهُنَّ لِتُضَيِّقُوا عَلَيْهِنَّ وَإِن كُنَّ أُولَاتِ حَمْلٍ فَأَنفِقُوا عَلَيْهِنَّ حَتَّى يَضَعْنَ حَمْلَهُنَّ...

Onları (boşadığınız, lakin gözləmə müddətləri sona yetməmiş qadınları) imkanınız" çatdığı qədər öz yaşadığınız yerdə sakin edin. (Bu qadınları) sıxışdırmaq (evdən çıxıb getməyə məcbur etmək) məqsədilə onlara zərər (əziyyət) verməyə cəhd göstərməyin. Əgər onlar hamilədirlərsə, həmləni



---

.Nisa" surəsi, ayə: ١٩" [١]-١

.Nisa" surəsi, ayə: ١٢٩" [٢]-٢

(yerə qoyana qədər xərclərini verin..."(۱)

:Yenə başqa bir ayədə buyurur

وَإِذَا طَلَّقْتُمُ النَّسَاء فَبَلَغْنَ أَجَلَهُنَّ فَأَمْسِكُوهُنَّ بِمَعْرُوفٍ أَوْ سَرِّحُوهُنَّ بِمَعْرُوفٍ وَلاَ تُمْسِكُوهُنَّ ضِرَارًا لَّتَعْتَدُواْ وَمَن يَفْعَلْ ذَلِكَ فَقَدْ ظَلَمَ نَفْسَهُ وَلاَ تَتَّخِذُوَاْ آيَاتِ اللهِ هُزُوًا...

Qadınlarınızı (rici talaqla) boşadığınız və onların gözləmə müddəti başa çatdığı zaman" onları ya xoşluqla saxlayın, ya da xoşluqla buraxın. (Əziyyət və) zərər vermək məqsədilə haqlarına təcavüz edib onları saxlamayın! Hər kəs bunu etsə, şübhəsiz ki, özünə zülm etmiş olar. Allahın ayələri (hökmləri) ilə oynamayın (onlara istehza (etməyin)..."(۲)



---

۱- [۱] "Təlaq" surəsi, ayə: ۶.

۲- [۲] "Bəqərə" surəsi, ayə: ۲۳۱.

### HİCABIN TARİXİ

Tarixdə göstərilir ki, yəhudi qövmləri, keçmiş iranlılar və çox ehtimal ki, hind milliyyəti arasında hicab varmış və hətta İslamda buyurulan hicabdan daha şiddətli olmuşdur. Hərçənd, cahillik dövründə ərəblərdə kamil hicab olmamış və İslam zühur etdikdən sonra yaranmışdır. Vil Dorant yəhudi qövmü və "təlmud" qanunu haqda belə yazır: "Əgər bir qadın yəhudi qanununu pozsaydı, məsələn, başını bağlamadan camaatın arasına çıxsaydı, yaxud ümumi yerlərdə dolansaydı, yaxud müxtəlif zümrələrdən olan kişilərlə söhbət etsəydi və yaxud evdə səsini qonşuları eşidəcək qədər ucaltsaydı, bu zaman kişi onu mehriyyəsini vermədən təlaq verə bilərdi."(١)



---

١- [١] "Tarixi-təməddün", ١٢-ci cild, səh. ٣٠.

:Həmçinin qədim iranlı qadınlar haqda belə yazır

Cəmiyyətin yuxarı və varlı təbəqəli qadınları bağlı taxtları (faytonları) istisna etməklə niqabsız evdən çıxmağa cür`ət edə bilmirdilər. Onlara kişilərlə aşkar şəkildə əlaqə saxlamaq əsla icazə verilmirdi. Ərli arvadlar hətta ata və yaxud qardaşlarını görmək belə hüququna malik deyildilər. Qədim iranlıların şəkil və yaxud heykəlləri içərisində heç bir qadın surəti görünmür və onların adları belə nəzərə çarpmır..."(۱)

Bəli, İslam zühur etdikdən sonra nadan ərəblər İslam geyimi və kamil hicabı qəbul .etdilər

Zəməxşəri nəql edir ki, Ayişə həmişə ənsarlı qadınları belə mədh edirdi: "Ənsarlı qadınlara afərin! "Nur" surəsi nazil olduqdan sonra onlardan bir nəfər belə əvvəlki kimi geyinmədi. Onlar başını qara örtüklərlə bağlayırdılar, sanki başları üstündə bir qarğa oturmuşdur."(۲)



---

.Tarixi-təməddün", ۱-ci cild, səh. ۵۵۲" [۱]-۱

.Əl-kəşşaf", "Nur" surəsinin ۳۱-ci ayəsinin təfsiri" [۲]-۲

Həzrət Musanın (ə) beşinci tövsiyəsində ailə ocaqları mədh edilir və cəmiyyətdə “mə`bəd” istisna olunmaqla, ən yüksək məqamda yerləşir. O zaman ailə ocaqlarına olan ehtiram və əhəmiyyət orta və yeni əsrlərdə Avropa ölkələrində də gözlənilirdi. Lakin elm və texnologiya tərəqqi etdikdən sonra ailə ocaqlarının məqamı endi və dağılmağa başladı.(١)

Xristian aləminin Qelment və Tirtolyan adlı iki böyük şəxsiyyəti hicab haqda belə deyir: “Qadın ev şəraitindən başqa hallarda hicablı olmalı və özünü tamamilə örtməlidir. Çünki hicab onun bədənini örtə biləcək yeganə geyimdir və onu yad gözlərin baxışlarından qoruyur. Qadın üzünü açıq qoymamalıdır ki, başqaları onun üzünə baxmaqla günaha düşsün. Allah dərgahında İsa peyğəmbərin



---

١- [١] “Tarixi-təməddün”, ١-ci cild, səh. ۴٩٢.

dinini qəbul edən mö`min qadına özünü bəzəmək yaraşmaz və hətta onun təbii gözəlliyi belə, gizli saxlanılmalıdır. Çünki baxanlar üçün təhlükəlidir. Aynaya baxmaqla başın saçını darayıb bəzəmək yalnız həya və iffətini itirmiş qadınların xüsusiyyətlərindən sayılır...”(۱)

Tövratın “yaradılış” bölümündə belə oxuyuruq: “Rəfəqə gözlərini qaldırıb, İshaqı gördü. Daxmasından çölə çıxıb, xidmətçisindən soruşdu: “Səhrada bizim pişvazımıza çıxan bu kişi kimdir?” Xidmətçi dedi: “Mənim sərvərimdir.” Bu zaman niqabını götürüb, özünü örtdü.”(۲)

Əş`iya peyğəmbərin kitabında belə yazılmışdır: “Allah Sionun qızlarını təkəbbürlü olduğu, kişiləri gözaltı baxışlarla süzdükləri və naz-qəmzə ilə yol gedərək ayaqlarına taxdıqları xal-xalların səsini ucaltdıqları üçün keçəl və övrətini aşkar edəcək...”(۳)

Pulsun risaləsində belə yazılır: “Həmçinin qoca qadınlar təqvalılardan olsun, qeybət etməsin və şəraba qul olmasınlar, əksinə yaxşı əməllər örnəyi olmaqla cavan qadınlara başa salsınlar ki, öz ərlərini sevsinlər, düşüncəli, iffətli və evdar, yaxşı və ərlərinə müti olsunlar...”(۴)

səh:۴۰

---

۱- [۱] “Zən və azadi”, səh. ۵۲, ondan nəqlən.

۲- [۲] “Tövrat”, “yaradılış” bölümü - ۲۴-cü bölüm, ayə: ۶۴-۶۵.

۳- [۳] “Tövrat”, Əş`iya peyğəmbərin kitabı, ۳-cü bölüm, ayə: ۱۶ və ۲۵.

۴- [۴] “İncil”, Pulsun Timlisə yazdığı risalə, ۲-ci bölüm, ayə: ۱ və ۸.

## HİCABİN İDEOLOJİ SƏBƏBLƏRİ

**İşarə**

:Müsəlman qadın beş əsas və ideoloji səbəblərə söykənərək hicabı özünə vacib bilir

**:Hikmətli Allaha etiqad .۱**

Müsəlman qadın deyir: Mən bir çox enişli-yoxuşlu yollar, dərin quyulardan ibarət dünyada özümü hidayət etmək üçün aləmlərin Rəbbi və insanın Xaliqindən yapışmalı, Onu özümə ən yaxşı dəlil və yolgöstərən seçməli və doğru yola yönəlmək üçün göndərdiyi göstərişlərə itaət etməliyəm. Geyim forması həyatımda yerinə yetirdiyim minlərlə əməl və rəftarlardan biridir ki, yalnız öz əql və düşüncəmə əsaslanmaqla onun xoşbəxt, ya bədbəxtlik yönünü ayırd edə bilmərəm. Odur ki, bu yolda öz mehriban Xaliqimə itaət edirəm ki, mənə və digər mö`minə qadınlara belə :buyurmuşdur

وَقُل لِّلْمُؤْمِنَاتِ يَغْضُضْنَ مِنْ أَبْصَارِهِنَّ وَيَحْفَظْنَ فُرُوجَهُنَّ وَلَا يُبْدِينَ زِينَتَهُنَّ إِلَّا مَا ظَهَرَ مِنْهَا وَلْيَضْرِبْنَ بِخُمُرِهِنَّ عَلَى جُيُوبِهِنَّ وَلَا يُبْدِينَ زِينَتَهُنَّ إِلَّا لِبُعُولَتِهِنَّ أَوْ آبَائِهِنَّ أَوْ آبَاء بُعُولَتِهِنَّ أَوْ أَبْنَائِهِنَّ أَوْ أَبْنَاء بُعُولَتِهِنَّ أَوْ إِخْوَانِهِنَّ أَوْ بَنِي إِخْوَانِهِنَّ أَوْ بَنِي أَخَوَاتِهِنَّ أَوْ نِسَائِهِنَّ أَوْ مَا مَلَكَتْ أَيْمَانُهُنَّ أَوِ التَّابِعِينَ غَيْرِ أُوْلِي الْإِرْبَةِ مِنَ الرِّجَالِ أَوِ الطِّفْلِ الَّذِينَ لَمْ يَظْهَرُوا عَلَى عَوْرَاتِ النِّسَاء وَلَا يَضْرِبْنَ بِأَرْجُلِهِنَّ لِيُعْلَمَ مَا يُخْفِينَ مِن زِينَتِهِنَّ...

Mömin qadınlara de ki, gözlərini haram buyurulmuş şeylərdən çevirsinlər“ (naməhrəmə baxmasınlar), ayıb yerlərini (zinadan) qorusunlar (və ya örtülü saxlasınlar); öz-özlüyündə görünən (əl, üz) istisna olmaqla, zinətlərini (zinət yerləri olan boyun, boğaz, qol, ayaq və s. naməhrəmə) göstərməsinlər; baş örtüklərini yaxalarının üstünə çəksinlər (boyunları və sinələri görünməsin); zinət yerlərini ərlərindən, yaxud öz atalarından, yaxud ərlərinin atalarından (qayınatalarından), yaxud öz oğullarından, yaxud ərlərinin oğullarından, yaxud öz qardaşlarından, yaxud qardaşlarının oğullarından, yaxud bacılarının oğullarından, yaxud öz (müsəlman) qadınlarından, yaxud sahib olduqları (müşrik) cariyələrdən, yaxud kişiliyi qalmamış (onlarla birlikdə yemək yeyən) xidmətçilərdən, yaxud qadınların məhrəm yerlərini hələ anlamayan uşaqlardan başqasına göstərməsinlər; gizlətdikləri bəzək şeylərini (xalxallarını) göstərmək üçün ayaqlarını (yerə və ya bir-birinə) vurmasınlar. Ey möminlər! Hamınız Allaha

(tövbə edin ki, nicat tapasınız!"(١)

**:Ailə ocaqların qorunması .٢**

Ailə insan ictimasının əsasını təşkil edir. Əgər insan heyvani yaşayışdan xaric olub, .insanlıq həyatına qədəm qoymaq istəyirsə, mütləq ailə qurmalıdır

Müsəlman qadın deyir: Mən ailədə ümumi əlaqələrin başçısı və ailəvi rabitələri nizamlayanamsa, bütün varlığımla ömrümün hər bir anı fikrim, qərizəm, hissiyyatım və .şəfqətimlə həyat yoldaşımın və övladlarımın qulluğunda hazır olmalıyam

Küçə-bazarlarda, xiyabanlarda, idarələrdə üzləşdiyim kişilərə öz əsas fikrimi aşkara edə bilmədiyim üçün aşkar rəmz və kinayə ilə örpək və çarşab örtürəm ki, !rastlaşdığım hər bir kişi bu rəmz və əlaməti, məram və əqidəmi başa düşsün

**:İnstinktual hislərin normal saxlanılması .٣**

Müsəlman bir qız deyir: Cinsi instinkt və daxili istəyimə əsasən, bir gün ailə qurmalı və onu həyatda gerçəkləşdirmək arzusundayam. Amm elm və təhsillə məşğul olacağım və ailəvi həyatın necəliyini öyrənəcəyim zamana qədər sahib olduğum fikir və düşüncədən dönmək və inhirafa yuvarlanmaq istəmirəm. Evlənmək və instiktual ,hislərimə cavab vermək istədiyim zaman onu evdə, ata-anamın



---

.Nur" surəsi, ayə: ٣١" [١]-١

xüsusilə mənim şəri vəlim olan atamın hüzurunda keçirməyi istəyirəm; nəinki küçə-bazarlarda və xiyabanlar! Mən öz məram və məqsədimi məni görən, meyl və istəkləri təhrik olunan oğlanlara başa salmaq üçün ilk öncə sadə və adi şəkildə yol getməliyəm ki, onların cinsi istəklərini təhrik etməyim. Həmçinin hicab adı ilə öz geyimimə fikir verərək onları başa salmalıyam ki, əgər mənimlə evlənmək istəyirlərsə, evə, ata-anamın hüzuruna gəlib, öz təkliflərini bildirməli və razılıq verildiyi zaman bir-birimizlə !evlənməliyik

**:Tarixin şahidliyi .۴**

Düzgün tarixə əsasən, müxtəlif əsrlər boyu qadınlar pak və sağlam fitrətlə hicab və geyimləri kişilərlə müqayisədə çox olmuş və hətta qədim iranlılar, yəhudilər və çox ehtimal ki, hindistanlılarda da örpək mövcud olmuşdur. Baxmayaraq, ərəblərin cahillik .dövründə hicab olmamış və İslamdan sonra yaranmışdır

**:Kor–korana təqliddən uzaq olmaq .۵**

Kor-korana təqlid insanın insanlıq məqamından süqut etməsinin son dərəcəsidir. Çünki təqlid edən şəxs insanlıq şəxsiyyətini unudur, ixtiyari işlərini başqalarına həvalə .edir və beləcə, öz ixtiyarı ilə bir işə belə qadir ola bilmir

Müsəlman qadın yalnız Allaha pərəstiş

səh:۴۴

etdiyindən, yad və istismarçı ölkələrdən gələn yaşayış vəsaitini araşdırmadan qəbul etmir. Müsəlman qadın elm, teknologiya və həqiqi sivilzasiyanı qəbul etsə də, qərbin mənfur mədəniyyətini, çirkinliyi, əyyaşlığı, nəfsi istəklərə uymağı, eləcə də, yad geyim .modalarını,qeyri-həqiqi zinətləri və açıq-saçıqlığı rədd edir

## HİCABIN HƏQİQİ FƏLSƏFƏSİ

### İşarə

Geyim və hicabın yaranmasının əsas və kökünü qadının Allah-taala tərəfindən .daxilində qoyulmuş məharətli instinktual hislərində arayıb-axtarmaq lazımdır

Qadının həya, iffət, meyl və geyim kimi cinsi əxlaq və rəftarının əsas səbəbi və onun necə yarandığı ilə əlaqədar daha dəqiq nəzəriyyələr vardır. Belə ki, qadının bu əxlaqı kişinin müqabilində öz mövqeyini qorumaq və özünü qiymətli-dəyərli göstərmək üçün .ilham aldığı bir tədbirdir

Digər tərəfdən burada belə sual yaranır ki, görəsən, kişinin qadından ləzzət alması təmənnasız olmalıdırmı? Görəsən, kişinin haqqı vardırmı ki, hər bir yerdə hər bir !?qadından bacardığı qədər ləzzət alsın

Bu məsələnin incəliyinə və əsl ruhuna nəzər yetirən İslam dini bu sualların qarşısında qətiyyətlə dayanır və belə cavab verir: “Xeyr! Şəriət baxımından kişilər qadınlara yalnız ,ailə mühitində

qanuni evlənmək çərçivəsində, eləcə də bir sıra ağır iltizamlarla yanaşı, qadından qanuni həyat yoldaşı kimi ləzzət ala bilərlər. Lakin ictimai mühitlərdə yad qadınlardan hər hansı bir cinsi və intim məqsədlərlə yanaşmaq qəti qadağandır. Qadınların da ailə ".mühitindən kənarda kişilərə bu məqsədlə yanaşmasına heç bir şəkildə icazə verilmir

İslamda hicab və geyim ümumi və əsaslı bir məsələdən nəş`ət tapmışdır, o da budur ki, İslam dini paklığın yüksək dəyərinə və əhəmiyyətinə, qadınla kişinin cinsi rabitələrinin - istər baxmaqla, istər toxunmaqla, istər səsini eşitməklə, istərsə də yaxınlıq etməklə - qanun çərçivəsində, ailə mühitində olmasına tam diqqət yetirmiş, bu paklığın hər hansı bir ad və ünvan altında ləkələnməsinə heç vaxt razı olmamış, iş və .fəaliyyəti isə cəmiyyətə məxsus etmişdir

:İslam geyiminin bir neçə fəlsəfəsi vardır

**:Ruhi–psixi aramlıq .۱**

Kişi-qadın münasibətlərinin qeyri-qanuni olması və rabitə azadlığı intim əlaqə və .həyəcanları artırır, cinsi istəklər ruhi susuzluğa çevrilir

Cinsi istək güclü instinktual bir qüvvədir ki, ona daha çox itaət olunduqda, daha da .həddini aşır və insanı ehtiras sadizminə yönəldə bilir

İslam bu qüvvəni ram etmək və mö`tədil saxlamaq üçün müəyyən tədbirlər irəli sürmüşdür

ki, onlardan biri də naməhrəm kişi və qadınların bir-birlərinə baxmaqdan çəkinmələridir.

Allah-taala Qur`ani-Kərimdə buyurur:

قُل لِّلْمُؤْمِنِينَ يَغُضُّوا مِنْ أَبْصَارِهِمْ وَيَحْفَظُوا فُرُوجَهُمْ ذَلِكَ أَزْكَى لَهُمْ إِنَّ اللهَ خَبِيرٌ بِمَا يَصْنَعُون. وَقُل لِّلْمُؤْمِنَاتِ يَغْضُضْنَ مِنْ أَبْصَارِهِنَّ وَيَحْفَظْنَ فُرُوجَهُنَّ...

“(Ya Rəsulum!) Mömin kişilərə de ki, gözlərini haram edilmiş şeylərdən çevirsinlər (naməhrəmə baxmasınlar), ayıb yerlərini (zinadan) qorusunlar (və ya örtülü saxlasınlar). Bu onlar üçün (ədəb-ərkan, təmizlik baxımından) daha yaxşıdır. Şübhəsiz ki, Allah onların nə etdiklərindən xəbərdardır! Mömin qadınlara de ki, gözlərini haram buyurulmuş şeylərdən çevirsinlər (naməhrəmə baxmasınlar), ayıb yerlərini (zinadan) qorusunlar...”(١)

### ٢. Ailə ocaqlarının möhkəmlənməsi:

Şübhəsiz, ailə rabitələrinin möhkəmlənməsinə və ər-arvad münasibətlərinin səfa-səmimiyyətinə səbəb olan hər bir şey ailə ocaqları üçün faydalıdır və onu ələ gətirmək üçün çoxlu çalışmaq lazımdır. Amma buna əks olaraq ər-arvad münasibətlərinin süstləşməsi və yaxud pozulmasına səbəb və ailə ocaqlarına zərərli olan hər hansı bir şeylə mübarizə aparmaq zəruridir.

Cinsi ləzzətlərin ailə mühitinə və qanuni



---

١- [١] “Nur” surəsi, ayə: ٣٠-٣١.

evlənmək çərçivəsinə məxsus edilməsi ər-arvad münasibətlərini möhkəmləndirir, .qəlblərini bir-birinə bağlayır

Ailə baxımından hicabın və qanunsuz cinsi ləzzətlərin qadağan edilməsinin fəlsəfəsi odur ki, insanın qanuni həyat yoldaşı ruhi-psixi yönlərdə onun xoşbəxtlik amili hesab edilir. Halbuki cinsi azadlıq sistemində psixoloji baxımdan qanuni həyat yoldaşı rəqib sayılır və nəticədə ailə ocağı ədavət və kin-küdurət üzərində qurulacaq. Bu isə cavanların cavanlıq yaşlarından evlənməkdən qaçmasının amillərindən biri kimi, qadın və kişilərin fitnə-fəsad və çirkinliyə düşməsi ilə nətiəcələnir və ailə quruluşunun .şirinliyindən məhrum olur

Əgər qanuni həyat yoldaşı olan kişi küçə-bazarlarda açıq-saçıq, hicabsız və bəzənmiş cavan qadınla üzləşdikdə, aydındır ki, diqqətini ona cəlb edəcək və nəhayət, onunla .əlaqə saxladığından, öz həyat yoldaşına rəğbətsiz olacaq və ailə quruluşu süstləşəcək

**:Cəmiyətin möhkəmlənməsi .۳**

Cinsi ləzzətləri ailə mühitindən cəmiyətə çəkmək iş qüvvələri və ictimai fəaliyyətləri zəiflədir. Buna əks olaraq hicab və örpəyin müxalifləri deyirlər ki, hicab ictimi .qüvvələrin yarısının iflic olmasına səbəb olur

Görəsən, qızla oğlan bir-birindən ayrı mühitlərdə

təhsil alsalar, qızlar özlərini örtsələr və örpəkli olsalar, yaxşı dərs oxuyar və yaxşı düşünər, yoxsa, hər bir oğlanın kənarında özlərini kosmetika maddələri ilə !?gözəlləşdirən açıq-saçıq bir qız olsa

Məgər dəqiq statistik məlumatlara əsasən, yol qəzasının böyük bir hissəsini ?sürücülərin diqqətini özünə cəlb edən açıq-saçıq qadınlar təşkil etmirmi

**:Qadının dəyər və ehtiramı .۴**

Şübhəsiz, qadın qəlbi, şəfqəti və emosional hisslərlə kişidən üstündür. Odur ki, qadının özü ilə kişi arasında pərdə saxlaması və həya-iffətli olması sirli vasitələrdən biri kimi, .kişinin qarşısında öz məqam və mövqeyini qorumaq üçün ondan istifadə etməlidir

İslam buna təkid edir ki, qadın nə qədər mətanətli, vüqarlı olsa və özünü naməhrəm .kişilərin gözündən örtsə, ehtiramını artıracaqdır

Hicabsız və və açıq-saçıq qadına nə qədər diqqət yetirilsə də, ehtiras yönünü daşıyacaq və nəticədə onun həqiqi dəyərləri unudulacaq. Məhz bu səbəbdən, zahiri gözəlliyi və cazibəsi olduğu vaxta qədər diqqət mərkəzində olacaq. Bu isə aradan .getdikdə, qürbət və pərişanlıq hissi keçirəcəkdir

Açıq-saçıqlıq qadın şəxsiyyətinin həqiqi dəyərini itirir və onu olduğu kimi göstərməyin qarşısını alır. Məhz bu səbəbdən, zahiri daha da gözəl olan qadınlar irəli çıxaraq səbəbsiz yerə tərəqqi edir və

.həqiqi dəyərləri rövnəqsiz cilvələndirir

Qadınların həqiqi dəyər və istedadlarının yalnız zahiri və cismi yönlərin şüası altında saxlanılması və bunun dəyər və şəxsiyyətin meyarı kimi təqdim edilməsi doğrudan da, .düzgün deyil və qadının öz zərərinədir

Onlar bununla özlərini təkamül və tərəqqidən saxlayacaq və başqalarının çirkin baxışlarının əsarətinə düşəcəkdir. Odur ki, açıq-saçıqlıq qadının həqiqi dəyərlərini cismi görüntülərin şüası altına salacaq və onu başqalarının tamah və nəfsinin istəklərinə .fəda edəcəkdir

**:İffətli qadının tanınması .۵**

Allah-taala “Əhzab” surəsinin ۵۹-cu ayəsində hicab və örpəyin mühüm fəlsəfəsinə :toxunaraq buyurur

ذَلِکَ أَدْنَی أَن يُعْرَفْنَ فَلَا يُؤْذَيْنَ

Bu (İslam örpəyi) onların (imanlı və iffətli qadınların) tanınması və onlara əziyyət“ ”.verilməməsi üçün daha münasibdir

Beləliklə, müsəlman qadının iffəti və kamil hicabı hörmət və şəxsiyyətinin təcəssümü, şəhvətpərəst və nadanların əzab-əziyyətinə və naməhrəmlərin ehtiraslı baxışlarına məruz qalmaması üçün ən yaxşı ictimai silahıdır. Hətta azğın şəxslər həmişə iffətli və hicablı qadınlara xüsusi hörmətlə yanaşır, onlara əziyyət verməkdən həya edir və ,bunu özlərinə icazə vermir, hətta öz fikirlərinə belə gətirmirlər. Odur ki

:Peyğəmbəri-Əkrəm (s) buyurmuşdur

انما مثل المرأه الصالحه مثل الغراب الأصم الذی لا یکاد یقدر علیه

Həqiqətən, təqvalı, hicablı və iffətli qadın “ə`səm” qarğasına bənzəyir ki, ona hakim“ (olmaq mümkün deyil.”(١



---

.Vəsailüş-şiə”, ١۴-cü cild, səh. ٢٢“ [١]-١

## HİCABIN DOĞRULUĞU

**İşarə**

Hicabın doğruluğu, layqeydlik və açıq-saçıqlığın isə batil olmasının müəyyən yolları :vardır ki, biz burada onların bir neçəsinə toxunacağıq

**:Əql və təfəkkür .۱**

Əqlin hökmünə əsasən, bütün sevimli və dəyərli varlıqlar mütləq yad əllərdən uzaq olmalı və qorunub-saxlanılmalıdır; əks təqdirdə əldən gedəcək və yaxud zərər görəcəkdir. Odur ki, zahirdə zərif və incə, batində isə qəribə həqiqətə malik olan qadın sevilir və yüksək dəyərə malik olduğu üçün iffət və İslam örpəyi adlı sədəfdə saxlanılmalıdır ki, onun dəyər və sevimli olmasının əzəməti qorunsun və yad adamların .zəhərli baxışlarından uzaq olsun

Eyni zamanda cismi azadlıq və ürək sevən rəftarlar ruhi və mənəvi azadlığa zərər vurmamalıdır. Qeyd-şərtsiz azadlıq əqlin əsarətə

düşməsi, ruhun həbs edilməsi, qadın və cəmiyyətin digər fərdlərinin yüksək insanlıq qüvvələri və istedadlarının ardan getməsi ilə nəticələndiyindən, doğru və haqq bir əməl sayılmayacaqdır. Kamil geyim və iffət qadın və cəmiyyətin digər fərdlərinin fitri istedadlarının inkişafına, təkamülə və ruhi-psixi sakitliyə zəmin yaratdığı üçün haqq və .fəzilətlidir

**:Uzlaşma qanunu .۲**

:Bu məsələ ilə əlaqədar iki psixoloji əsas vardır

a) (İki və yaxud bir neçə nəfər arasında) ruhi-psixi oxşarlıq onların bir-birinə cəzb .olunması və yaxınlaşmasına səbəb olur

b) Onların arasında uzlaşma və oxşarlıq olmadıqda, bir-birinə nifrət edəcək və .nəticədə bir-birindən ayrılacaqlar

Buna əsasən, hicablı və iffətli qadınlar saf və mö`min kişilərin, örpəksiz və açıq-saçıq .qadınlar isə qeyrətsiz və laqeyd kişilərin diqqətini özünə cəlb edəcəkdir

**:Təkamül dərəcəsi .۳**

Hər bir əməl və fenomenin fəzilət və doğru olmasının meyarlarından biri də onun insanın təkamül və səadətində zərurət və təsiridir. Şübhəsiz, açıq-saçıqlıq, özünü göstərmək və müasir modalarla yaşamaq təbii həyatda həqiqi cismi ehtiyacları təmin etməkdə və şəxsi gigiyenada zərurət sayılmadığı

kimi, ruhi-psixi gərginliklərə və səadətli mənəvi həyatın ehtiyaclarına da cavab verməyəcəkdir. Əksinə həyatın həm maddi, həm də mənəvi yönlərinə zərər yetirəcək, .fərdin və cəmiyyətin cismi təmizliyini, ruhi-psixi sağlamlığını aradan qaldıracaqdır

**:İnsani və heyvani xüsusiyyətlərin aşkar edilməsi .۴**

İnsan iki xüsusiyyətə malikdir: insani (mələkuti) və heyvani (nəfsani). Hicabsızlıq, açıq-saçıqlıq, eləcə də kişilər də alçaq və çirkin rəftarlar heyvani xüsusiyyətdən və nəfsin zəif nöqtəsindən yaranır və insanın insani-mələkuti xüsusiyyətinə hədsiz dərəcədə zərərlər endirir. Bunun müqabilində isə iffət, qeyrət və kamil hicab güclü insani və ruhi .xüsusiyyətdən qaynaqlanır

**Hiss və təcrübə .۵**

Bir şeyi canlı şəkildə müşahidə və təcrübə etməklə onun doğru və ya batil olduğunu ayırd etmək olar. Bu meyara əsasən, laqeydliyin, hicabsızlığın və açıq-saçıqlığın təhlükəsi və acınacaqlı nəticəsi, eləcə də hicabın və iffətli geyimin yaxşı aqibəti birinci .əməlin rəzilət və batil, ikinci əməlin isə fəzilət və haqq olduğunu göstərir

**:Fitrət və daxili şüur .۶**

İnsan xüsusi şəkildə yaranmış və bir sıra aydın, fitri

və qiymətli həqiqətlərin köməyi ilə hidayət olunmuşdur. Belə ki, yetkinlik həddinə çatdıqda, düşünmədən, fikirləşmədən və təlimə ehtiyac duymadan onu qavrayıb başa düşür və ona doğru yönəlir. O, bir növ agahlıq və düşüncə, tövhidə yönəliş, etiqadi, əxlaqi və əməli gözəlliklərlə xəlq olunduğu üçün batil əqidələrə və əxlaqi-əməli .çirkinliklərə nifrət edir və onlardan uzaqlaşır

Hicab və iffətli geyim qadının canının dərinliyindən eşitdiyi nida və dəvətdir, öz daxilindən ona doğru yönəldiyi bir cazibədir, və hicabsızlıq, açıq-saçıqlıq və zahiri .gözəllikləri göstərməyə nifrət edir

Hicabın fitri olmasının nişanələri ilə əlaqədar müxtəlif tarixi kitablar və mədəni əsərlər göstərir ki, hicab mədəniyyəti həmişə qadınlar arasında görünmüş və heç də müəyyən .bir məzhəb və irqə məxsus olmamışdır

Şəhid Mütəhhəri bu haqda yazır: “Ümumiyyətlə, həya və iffət, eləcə də qadının kişiləri gördükdə, özünü örtməyə meylli olması kimi cinsi əxlaqın kökü ilə bağlı bəhs üzərində bir neçə nəzəriyyə irəli sürülmüşdür ki, ən dəqiq nəzər budur: “Həya, iffət və geyim qadının kişi müqabilində özünü dəyərləndirmək və mövqeyini qorumaq üçün ilham aldı bir tədbirdir. Qadın fitri agahlığı və özünəxass hissi ilə başa düşür ki, cismi baxımdan kişi ilə ayaqlaşa bilməz. Əgər həyat meydanında kişi ilə

ayaqlaşmaq istəsə, kişinin zor və gücünün öhdəsindən gələ bilməyəcək. Digər tərəfdən də, kişinin zəif nöqtəsini onun xilqətində qoyulmuş ehtiyacında görür ki, onu eşq və sevgi, qadını isə məşuq və sevilən cilvəsi qərar vermişdir. Qadın öz məqam və mövqeyini kişinin müqabilində gördükdə və öz müqabilində kişinin zəif nöqtəsini bildikdə, kişinin könlünü ələ almaq üçün özünü bəzəməyə və zinətləndirməyə əl atdığı kimi, kişinin əlindən uzaq bir yerdə olmağa da can atır. Buna görə də qadın özünü kişiyə ucuz satılmamasını bildikdə, onda eşq, istək və sevgi atəşini söndürüb, nəticədə (öz məqam və mövqeyini yüksəltməlidir.”(١)

Qadının kamil hicabının fitri olmasının başqa bir nişanəsi də budur ki, bütün ilahi dinlərdə iffətli geyim bir dəyər kimi qadına vacib olmuşdur; gözü haram baxışlardan qorumaq, qadınla kişinin (bir məclisdə) qarışmasından çəkinmək, ərdən başqaları üçün təhrikedici kosmetika maddələrindən istifadə etməmək, yad adamlarla qeyri-şəri əlaqə yaratmaq və təhrikedici söhbət və rəftar kimi digər məsələlərdə də iffəti .qorumaq tövsiyə olunmuşdur

**:Quran və sünnənin hökmü .٧**

Doğru və puç dəyərləri, yaxşı və pisi, haqq ilə batili ayırd edən ən mühüm və üstün -mənbə Qurani



---

.Hicab məsələsi”, səh. ٦٢-٦٣“ [١]-١

.Kərim və Peyğəmbəri-Əkrəm (s) sünnəsindən ibarət olan ilahi din və vəhydir

Böyük İslam dini qadının incə quruluşu, fitri və təbii gözəlliyini nəzərə alaraq hikmət və ədalətlə qadınları hicab və iffətli geyimə əmr edir ki, onların ailə ocaqlarında hörməti, dəyəri və sevimli məqamı qorunsun, cəmiyyətin bütün fərdləri ilə birgə cinsi təhrik və azğınlıqlardan uzaq olaraq sağlam ictimai mühitdə yüksək ruhi duyğuları çiçəklənsin, təkamül karvanından geri düşməsin və nəhayət, dünya və axirətdə böyük səadətə (nail olsun.(۱

Bu məsələ ilə bağlı bir çox ayə və rəvayətlər vardır ki, inşaallah, yeri gəldikcə, qeyd .edəcəyik

səh:۶۰

---

".Asibşinasiye şəxsiyyət və məhbubiyyəte zən" [۱]-۱

Yaponiyalı qadın Saçiko Murata orta təhsilini bitirdikdən sonra Çelba universitetinin .۱ hüquq fakultəsinə qəbul olur. O, hüquq üzrə diplomunu aldıqdan sonra İlahiyyat fakultəsi üzrə təhsilini davam etdirir, ərəb və fars dillərini bilməsə də, tam ciddiyyətlə həmin dilləri öyrənir və nəhayət, İlahiyyat Elmləri Doktoru dərəcəsinə nail olur. Özü bütpərəst, əri məsihi idi. Çox ehtimal ki, İran İslam İnqilabından sonra müsəlman olur. Ondan "Sizin nəzərinizcə, hicab nədir?" "Siz hicablı qadınlara daha çox üstünlük verirsiniz, yoxsa açıq-saçıq qadınlara?" - deyə soruşulduqda, belə cavab verir: "Mən mütləq hicablı qadınlara üstünlük verir və əqlin qəbul etdiyi həddə hicab və örpəyi qəbul edirəm. Çünki qadının dəyəri hicablı olmasındadır. Adətən, hər bir insanın təbiəti tələb edir ki, müxtəlif məsələləri kəşf etsin. Qadınlar bu günkü kimi açıq-saçıq olduqda, bir daha kişilərin diqqətini özünə cəlb

etməyəcək. İnsan mühüm bir məsələ ilə bir neçə dəfə üzləşsə, təbii ki, həmin məsələ öz əhəmiyyətini itirəcəkdir. Bu məsələ ər-arvad münasibətlərinin möhkəmlənməsində böyük rol oynayır və olduqca təsirlidir. Geyimə laqeyd yanaşan və qısa libaslar geyinib açıq-saçıq gəzən qərb qadınlarının evlilik rabitələri elə də möhkəm deyildir. Yaponiya qadınları təhsil mövqelərindən asılı olmayaraq evdarlığa üstünlük verir, övladlarını yaxşı tərbiyələndirir və ərlərinə də daha çox ehtiram göstərirlər..."(۱)

۲. Qadınlar barəsində kino ssenarisi yazmaq ixtisası üzrə yüksək rütbələrə malik olan Alfred Hiçkak belə deyir: "Mənim nəzərimcə, qadın da çox həyəcanlı bir kino kimi olmalıdır. Yəni öz mahiyyətini çox az büruzə verməli, öz mahiyyətinin kəşf olunması üçün kişiləri daha artıq təxəyyül və təsəvvürə vadar etməlidir. Qadınlar həmişə bu əsasda rəftar etməli, yəni öz mahiyyətlərini az büruzə verməlidir ki, kişilər onun mahiyyətini kəşf etmək üçün özlərini daha çox zəhmətə salsınlar. Şərq qadınları bir neçə il bundan öncəyə qədər istifadə etdikləri hicab və niqab səbəbi ilə kişiləri istər-istəməz özlərinə cəzb edirdilər. Bu da onlara güclü cəzzabiyyət bağışlayırdı. Amma bu ölkələrin qadınları qərb qadınlarını yamsılamağa başladığı vaxtdan, tədricən, onların başında olan hicab aradan



---

۱-[۱] "Hüquqi-zən", Şəhid Mütəhhəri, səh. ۱۶.

getmiş, bununla eyni zamanda onların cinsi-mənəvi cazibəsi də azalmağa başlamışdır.”(۱)

۳. Bertrand Rassel deyir: “İncəsənət baxımından təəssüflü haldır ki, qadınları çox asanlıqla ələ gətirmək olur. Daha yaxşı olardı ki, qadınların vüsalı çox çətin olsun, amma qeyri-mümkün olmasın.”(۲)

۴. Bir neçə müddət bundan öncə müsəlman olan və Belçikada müsəlman qadınlarından ibarət dini qurumda hicab və İslam geyimi ilə bağlı tədris edən belçikalı qadın Viktoriya belə deyir: “İslam dinini qəbul etdikdən sonra İslam hicabına diqqət yetirmir və örpəkli olmağa elə də meylli deyildim. Lakin sonralar başa düşdüm ki, hicab mənim Allahla rabitəm deməkdir və mənə həmişə xatırladır ki, müsəlman bir şəxs kimi yaşamalıyam...”(۳)

۵. Məşhur xristian alimi Corci Zeydan deyir: “Hicab dedikdə, bədəni çadra, çarşab, niqab və bu kişi şeylərlə örtmək nəzərdə tutulursa, bu məsələ İslamdan, hətta İsa Məsih (ə) dinindən qabaq olmuş və xristianlar onda dəyişiklik etməmişlər. Orta əsrlərə qədər Avropada adi hicab olmuş və indiyə qədər də onun əsər-əlamətlərindən qalır.”(۴)



---

۱- [۱] “Hicab məsələsi”, Şəhid Mütəhhəri, səh. ۵۵-۵۶.

۲- [۲] Yenə orada, səh. ۵۵.

۳- [۳] “Maarif” jurnalı, ondan nəqlən, səh. ۴۲.

۴- [۴] “Tarixi-təməddün”, Vil Dorant, ۳-cü cild, səh. ۶۳.

## İSLAMDA ÇARŞABIN TARİXÇƏSİ

Bəziləri belə iddia edirlər ki, çox ehtimala görə, çarşab İranda qacarlar dövründə .yaranmış və onun din və məzhəblə heç də əlaqəsi yoxdur

:Bu iddianın cavabı belədir

BIRINCI: Bu iddianın sübutu üçün mötəbər sənəd və tarixi mənbə lazımdır ki, buna heç .bir sənəd göstərilməmişdir

İKINCI: Hicab və geyimlə bağlı mənbələrin şəhadətinə əsasən, tarixi fakt və sənədlər göstərir ki, çadra və çarşab şəklində olan hicab İranda Qacarlar dövründən yüzlərlə öncə yaranmışdır. Qədim iranlı qadınların şəkillərinə nəzər saldıqda, libasdan başqa, bədənlərini müasir qadının geyindiyi çarşaba bənzər çarşablarla örtdüklərinin şahidi (oluruq.(۱



---

.Peyami-qadın" jurnalı, ۱۹-cu say, səh. ۶۹" [۱]-۱

Qadınlar həxaməneşi və əşkanilər silsiləsi dövründə də başlarına çarşab örtürmüş və (ayaq topuqlarına qədər örtən uzun köynəklər geyinirmişlər.(١)

Həmçinin qadınlar sasanilər dövründə də bəzən başlarına geniş çarşab və dizləri ilə topuqlarının ortasına qədər olan örtük atırmışlar. Sasani qadınlarının gümüş (boşqablara çəkilmiş şəkillərinə baxdıqda, özlərini çarşabla örtdüklərini görürük.(٢)

Beləliklə, çarşab şəklində olan hicabın dərin tarixi-milli qaynağa malik olduğu sübuta .yetir

Üçüncü: Qurani-Kərimdə də çarşabdan ibarət hicab məsələsinə toxunulmuşdur. Belə :ki, mütəal Allah Peyğəmbəri-Əkrəmə xitab edərək buyurur

يَا أَيُّهَا النَّبِيُّ قُل لِّأَزْوَاجِكَ وَبَنَاتِكَ وَنِسَاء الْمُؤْمِنِينَ يُدْنِينَ عَلَيْهِنَّ مِن جَلَابِيبِهِنَّ ذَلِكَ أَدْنَى أَن يُعْرَفْنَ فَلَا يُؤْذَيْنَ وَكَانَ اللهُ غَفُورًا رَّحِيمًا

Ya Peyğəmbər! Zövcələrinə, qızlarına və möminlərin həyat yoldaşlarına de ki, (evdən “ çıxdıqda cariyələrə oxşamasınlar deyə, bədənlərini başdan-ayağa gizlədən) çarşablarını örtsünlər. Bu, onların tanınması (cariyə deyil, azad qadın olduqlarının bilinməsi) və onlara əziyyət verilməməsi üçün daha münasibdir. Allah bağışlayan və (rəhm edəndir.”(٣)

Ayədə qeyd olunan “cəlabib” sözü “cilbab” sözünün cəm forması olub, qadının bədənini



---

.Fərhəngi-berehnegi və berehnegi-fərhəngi”, Həddad Adil, səh. ۲۵“ [۱] -۱

.Hicab”, Məhdi Mehrizi, səh. ۴۶“ [۲] -۲

.Əhzab” surəsi, ayə: ۵۹“ [۳] -۳

(tamamilə örtən gen paltar mənasını daşıyır.(١)

Müxtəlif şahiddlər də “cilbab”ın bədəni başdan-ayağa qədər örtən gen paltar :mənasında olduğunu göstərir

a) Həzrət Fatimeyi-Zəhranın (ə.s) Fədək bağının özünə mənsub olduğunu sübut etmək :üçün evdən çıxıb məsciddə gedərkən geyindiyi paltarı haqda belə nəql olunmuşdur

لاثت خمارها على رأسها و اشتملت بجلبابها

Həzrət Fatimeyi-Zəhra (ə.s) məqnəə və yaylığını başına örtdü və başdan-ayağa“ (bədənini örtən gen paltarını geyindi.”(٢)

:b) Fəyyumi “Misbahul-münir” kitabında yazır

الجلباب ثوب اوسع من الخمار

”.Cilbab – gen paltar və məqnəədən böyükdür“

d) Digər hədislər də bunu təsdiq edir. O cümlədən, Peyğəmbəri-Əkrəm (s) belə :buyurmuşdur

و لغیر ذی محرم اربعه اثواب: درع و خمار و جلباب و ازار

(Bu) dörd paltar naməhrəm qadına aiddir: niqab, məqnəə, çadra və köynək.”(٣)“

s) Zəməxşəri və Alusi, İbn Abbasdan nəql edirlər ki, “cilbab” bədəni başdan-ayağa (örtən geyimə deyilir.(۴)



---

.Misbahul-münir”, Fəyyumi, “luhf” sözü“ [١]-١

.Əl-ehticac”, Təbərsi, ١-ci cild, səh. ٩٨“ [٢]-٢

.Məcməül-bəyan”, Təbərsi, ٧-ci cild, səh. ١۵۵“ [٣]-٣

Kəşşaf” təfsiri, “cilbab” ayəsini təfsiri; “Ruhul-məani” təfsiri, “cilbab” ayəsinin“ [۴] -۴ .təfsiri

## HİCABLA İFFƏTİN RABİTƏSİ

Bəziləri hicabla iffət arasındakı rabitə və nisbəti rədd etməklə hicabı qeyri-zəruri bir iş bilmişlər. Çünki onların nəzərincə, hicabsız iffəti əldə etmək mümkündür. İndi isə bu iki həqiqətin arasındakı əlaqə və səbəbi araşdırmaqla onların bir-birilə möhkəm ilgili .olduğunu sübut etmək istəyirik

## İFFƏTİN MƏFHUMU

Cəm forması “ifaf” olan iffət sözü halal və gözəl olmayan şeylərdən çəkinmək mə`nasındadır.

Rağib İsfahani yazır: “İffət qazanılan nəfsi halətə deyilir ki, insan onunla özünü ehtirasın qələbəsindən qoruyub-saxlaya bilər.”(١)

“Çəkindirən” və “qoruyub-saxlayan” mə`nasını daşıyan “iffət” ehtiras, nəfsani istək və təhrikin ziddinədir və bir neçə xüsusiyyətə malikdir:

١. İnsani xisləti göstərir;

٢. Daxili və batini haləti göstərir;

٣. İnsanın şəxsiyyətini bildirən xarici təzhürlərə malikdir;

٤. Bu təzahürlər iffətli insanın rəftar və danışıq tərzindən aşkar olur.

səh:٧١

---

١-[١] “Lisanül-ərəb”, “iffət” sözü.

.İffətə iltizamlı olmaq zəif və acizliklə yox, izzət və iqtidarla uyğundur .۵

.Bunu nəzərə alaraq demək olar ki, hicab və örpək iffət və həyanın nişanəsidir

## İFFƏTİN QİSMLƏRİ

### İşarə

İnsani xislət, nəfsani səciyyə və batini zinət sayılan “iffət” insanın bütün əməlləri, rəftarı, davranışı, danışığı və geyiminin iffətli, eləcə də ehtiras və heyvani rəzilətlərdən .uzaq olduğuna səbəb olur

:İffəti bir neçə qismə bölmək olar

**:Baxışda iffət .۱**

:Allah-taala buyurur

يَغْضُضْنَ مِنْ أَبْصَارِهِنَّ

Ya Rəsulum, mö`min kişi və mö`minə qadınlara de:) Gözlərini haram edilmiş)“ (şeylərdən çevirsinlər (naməhrəmə baxmasınlar).”(۱)

**:Namusluq iffəti .۲**

:Allah-taala buyurur



---

.Nur” surəsi, ayə: ۳۱“ [۱]-۱

وَيَحْفَظْنَ فُرُوجَهُنَّ

".Və ayıb yerlərini qorusunlar“

Bu ayənin təfsiri ilə bağlı imam Sadiqdən (ə) nəql olunan hədisdə buyurulur ki, ayədə məqsəd, ayıb yerlərini həyat yoldaşından başqa, başqalarının, hətta qadın və məhrəm şəxslərin baxışlarından qorumaq və örtülü saxlamaqdır. Bu hökmdə kişilər də keçmiş .hökm kimi, qadınlarla bərabərdirlər

**:Geyimdə iffət .۳**

:Allah-taala buyurur

وَلَا يُبْدِينَ زِينَتَهُنَّ إِلَّا مَا ظَهَرَ مِنْهَا

Və öz-özlüyündə görünən (əl, üz) istisna olmaqla, zinətlərini (təbii və süni zinətlərini“ (naməhrəmə) göstərməsinlər."(۱)

:Başqa bir yerdə isə belə buyurur

وَلْيَضْرِبْنَ بِخُمُرِهِنَّ عَلَى جُيُوبِهِنَّ

Və baş örtüklərini yaxalarının üstünə çəksinlər (ki, boyunları və sinələri“ (görünməsin)."(۲)

:Yenə də buyurur

وَلَا يُبْدِينَ زِينَتَهُنَّ إِلَّا لِبُعُولَتِهِنَّ أَوْ آبَائِهِنَّ أَوْ آبَاء بُعُولَتِهِنَّ أَوْ أَبْنَائِهِنَّ أَوْ أَبْنَاء بُعُولَتِهِنَّ أَوْ إِخْوَانِهِنَّ أَوْ بَنِي إِخْوَانِهِنَّ أَوْ بَنِي أَخَوَاتِهِنَّ أَوْ نِسَائِهِنَّ أَوْ مَا مَلَكَتْ أَيْمَانُهُنَّ أَوِ التَّابِعِينَ غَيْرِ أُوْلِي الْإِرْبَةِ مِنَ الرِّجَالِ أَوِ الطِّفْلِ الَّذِينَ لَمْ يَظْهَرُوا عَلَى عَوْرَاتِ النِّسَاء

Və zinət yerlərini ərlərindən, yaxud öz atalarından, yaxud ərlərinin atalarından“ (qayınatalarından), yaxud



---

.Yenə orada [۱]-۱

.Yenə orada [۲]-۲

öz oğullarından, yaxud ərlərinin oğullarından, yaxud öz qardaşlarından, yaxud qardaşlarının oğullarından, yaxud bacılarının oğullarından, yaxud öz (müsəlman) qadınlarından, yaxud sahib olduqları (müşrik) cariyələrdən, yaxud kişiliyi qalmamış (onlarla birlikdə yemək yeyən) xidmətçilərdən, yaxud qadınların məhrəm yerlərini hələ anlamayan uşaqlardan başqasına göstərməsinlər."(١)

Qadınların başqa bir vəzifəsi isə diqqəti cəlb edən və iffətsiz sayılan əməl və rəftarlardan çəkinməkdir. Allah-taala bu haqda buyurur:

وَلَا يَضْرِبْنَ بِأَرْجُلِهِنَّ لِيُعْلَمَ مَا يُخْفِينَ مِن زِينَتِهِنَّ

"Və gizlətdikləri bəzək əşyalarını (xalxallarını) göstərmək üçün ayaqlarını (yerə və ya bir-birinə) vurmasınlar."(٢)

**۴. Söz və danışıqda iffət:**

Qadınların digər vəzifələrindən biri də naməhrəm kişilərlə danışarkən iffətə raiayətin zəruriliyidir. Qur`ani-Kərimdə bu məsələ haqda buyurulur:

فَلَا تَخْضَعْنَ بِالْقَوْلِ فَيَطْمَعَ الَّذِى فِى قَلْبِهِ مرَضٌ وَقُلْنَ قَوْلًا مَّعْرُوفًا. وَقَرْنَ فِى بُيُوتِكُنَّ...

"(Yad kişilərlə) yumşaq (əzilə-əzilə) danışmayın, yoxsa qəlbində mərəz (şəkk, nifaq və günah mərəzi) olan tamaha (özgə təmənnaya) düşər. (Danışdığınız



---

١- [١] Yenə orada.

٢- [٢] Yenə orada.

zaman) gözəl danışın! (Əql və vəhyin rəsmi şəkildə qəbul etdiyi kimi, gözəl və layiqli (danışın!)..."(۱)



---

۱-[۱] "Əhzab" surəsi, ayə: ۳۲.

### KİŞİ İLƏ QADININ GEYİMDƏ FƏRQİ

İslamın şəri hökmləri insanların xeyir və məsləhətinin təmin edilməsini və onları təhdid edən fitnə-fəsadların qarşısının alınmasını nəzərə almaqla yanaşı xilqətin xüsusiyyətləri ilə mütənasibdir. Kişi ilə qadının örpək kimi bir çox şəriət hökmlərindəki .fərqi onların arasındakı yaranış fərqlərindən qaynaqlanır

Kişi ilə qadının cismi və ruhi-psixi fərqlərlə bağlı elmi-fziyoloji və psixoloji tədqiqatlara əsasən, kişilərin göz mühərrikləri qadınlarla müqayəsədə daha həssasdır. Buna əks olaraq qadınlarda isə toxunma mühərrikləri daha həssasdır.(١)

Elmi tədqiqat və təcrübələr göstərir ki, kişinin qadının bədəninə baxmaqla təhrik .olduğu qədər qadın kişinin bədəninə baxmaqla təhrik olmur



---

١- [١] "Fərhənge berehnegi və berehnegiye fərhəngi", səh. ۶٣, Doktor Məhmud .Behzaddan nəqlən

Cinsi psixologiyada da qadının bədənin bütün yerinin kişini təhrik etməsi sübuta yetsə də, amma kişilərdə belə deyildir.(١)

Müqəddəs İslam dini də nurlu əhkam və təlimlərini kişi ilə qadının xüsusiyyət və fərqləri ilə mütənasib göndərmişdir; məsələn, kişiləri instiktual göz mühərriklərinə nisbət daha çox həssas olduqları pozğunluqlardan qorumaq üçün naməhrəm qadınla üzləşdiyi zaman gözlərini qorumağa əmr olunmuşlar.

Bunun müqabilində, qadınlar daha çox həssas və incə olduqları üçün toxunma mühərriklərini nəzərə alaraq onları bu xüsusiyyətdən baş qaldıran pozuntulardan qorumaq üçün naməhrəm kişi ilə üzləşdiyi zaman örpək və hicaba əmr olunmaşlar.



---

١- [١] Yenə orada, səh. ۶۴.

## HİCABIN YARANMA TARİXİ İLƏ BAĞLI MÜXALİFLƏRİN NƏZƏRLƏRİ

**İşarə**

Hicaba müxalif olanlar “hicabın yaranma əbəbi” adı ilə haqsız cərəyanlara əl atmağa cəhd etmiş və bu məqsədlə müxtəlif nəzəriyyələr irəli sürmüşlər. İndi bu səbəblərin hər birini araşdırır və sonda düzgün nəzərə işarə edəcəyik.

**1. Rəyazət və rahiblik:**

Bəziləri deyirlər ki, qadın bəşəriyyət arasında kişilərin ən böyük eyş-işrət və ləzzət səbəbi olduğundan, kişilərlə bir yerdə olduqda, istər-istəməz ləzzətlərin ardınca düşəcəkdir. Bu fəlsəfənin ardıcılları cəmiyyəti tam şəkildə zahidlik və rəyazət ilə uyğunlaşdırmaq üçün hicabı qadınla kişi arasında bir növ maneə kimi yaratmış və ümumiyyətlə, insan hissini təhrik edən hər bir şeyə qarşı mübarizə aparmışlar.

**:Cavab**

Əvvəla, biz heç də rahiblik və tərki-dünyalığın dünyanın müxtəlif yerlərində mövcud olmasını inkar etmirik. Bəlkə də qadının hicaba riayət etməsini belə belə təfəkkür tərzininn hakim olduğu ölkələrdə onun səmərəsi hesab etmək olar. Lakin İslam dini hicabı təyin etdikdə, heç bir yerdə belə səbəblərə istinad etməmişdir, üstəlik belə .fəlsəfələr İslamın ruhu və onun sair göstərişləri ilə uyğun deyildir

İkincisi, İslam dini tərki-dünyalıq və rahiblik düşüncəsi ilə ciddi şəkildə mübarizə aparır. :Odur ki, mütəal Allah məsihilər haqda belə buyurur

وَرَهْبَانِيَّةً ابْتَدَعُوهَا مَا كَتَبْنَاهَا عَلَيْهِمْ

Onlar özlərindən rahiblik (tərki-dünyalıq) icad etdilər. Biz onu (rahibliyi) onlara vacib“ (etməmişdik.”(١

.Üçüncüsü də, işarə etdiyimiz kimi, hicab məsələsi məsihilikdən qabaq da olmuşdur

**:Təhlükəsizlik .٢**

Hicabın yaranması üçün qeyd olunan səbəblərdən biri də əmin-amanlığın, təhlükəsizliyin olmamasıdır. Qədim zamanlarda haqsızlıq, ədalətsizlik və hərc-mərclik həddini aşdığından quldur və təcavüz şəxslər heç nədən çəkinmədən camaatın mal-.dövlətinə, namusuna əl uzadırdılar

Sasanilər dövründə İranda baş verən ağır



---

.Hədid” surəsi, ayə: ٢٧“ [١] -١

cinayətlərin hamısı məhz bu məsələ ilə əlaqədar idi. Şahzadələr, kübar ailələrdən olanlar, kəndxuda və ərbablar hər hansı bir evdə gözəl bir qadının olduğundan xəbər .tutsaydılar, həmin evə hücum edərək qadını ərinin evindən zorla çıxardırdılar

**:Cavab**

Biz keçmiş zamanlarda haqsızlığın, ədalətsizliyin və təhlükəsizliyin olmamasını və nəticədə qadının məxfi saxlanılmasını heç vaxt inkar etmirik. Şübhəsiz, qadının örtülməsi barəsində ifratçı hicablar və əqidə tərzləri həmin tarixi hadisələrdən doğmuşdur. Lakin görəsən, qadınlar üçün İslamda müəyyən olunan hicab və örpəyin ?fəlsəfəsi və səbəbi də bundan ibarət olmuşdurmu

Əvvəla, müasir dövrdə qadınlar barəsində əmin-amanlığın tam şəkildə bərqərar .olmasını iddia etmək heç də düzgün deyildir

İkincisi, İslamda hicab və örpək göstərişinin səbəbi əmin-amanlığın olmaması deyil. Ən azı budur ki, bu səbəb tam mənada təhlükəsizliyin olmaması ilə əlaqələndirilə bilməz. Çünki bu məsələ nə İslam mənbələrində örpəyin səbəbi kimi bəyan edilir, nə də belə bir məsələ tarixi həqiqətlərlə uyğun gəlmir. Ərəblərin yaşadığı cahiliyyət dövründə hicab olmamamışdır, lakin eyni zamanda xüsusi qəbilə həyatı ilə əlaqədar olaraq fərdi əmin-əmanlıq və təhlükəsizlik

.mövcud idi

Üçüncüsü də, İslamda təhlükləsizlik yalnız insan canına aid edilməmiş, həm də ruhi-psixi təhlükəsizlik nəzərdə tutulmuşdur. İslam cəmiyyətində hər cəhətdən təhlükəsizliyin cari olduğunu istəyir və bunu açıq-saçıqlıq, yaxud yarımçılpaqlıqla .tə`min etmək olmaz

**:Kişinin həsəd hissi .۳**

Başqa bir nəzərə görə, kişilərin qadınları əsarət altına almasının əsas səbəbi onlarda olan xudpəsəndlik və yad adamlarlara qarşı həsəd hissidir. Adətən, kişilər öz arvadının yad kişilər tərəfindən, hətta baxmaqla və ya danışmaqla olsa da belə, ünsiyyət .saxlamasına həsəd hissi ilə yanaşırlar

**:Cavab**

Biz qəbul edirik ki, kişilər qadınların iffətli və pak olmasını istəyirlər; yəni kişi xüsusi rəğbətlə öz həyat yoldaşının pak və iffətli olduğunu istəyir. Lakin əsas məsələ budur ki, görəsən, bu hissə paxıllıq və həsəd adı vermək olar, yoxsa, “kişinin qeyrəti” adını?! Biz inanırıq ki, həsəd və qeyrət tamamilə bir-birindən fərqli iki sifətdir və hər hansı birinin kökü bir-birindən ayrıdır. Həsədin kökü və əsası xudpəsəndlik, eqoistlik,, şəxsi və instinktual hisslərdir. Qeyrət isə ictimai bir hiss kimi hədəf və məqsədi başqalarına doğrudur. Mütəal Allahın

nəsillərin ayırd edilməsi və bir-birinə qarışmaması üçün insanların vücudunda .qoyduğu bir növ gözətçi hissinə qeyrət deyilir

Başqa sözlə desək, qeyrət nəfsani bir halətdir ki, ona əsasən, insan öz nəfsinin .kəramətinə əks bir şey gördükdə, əzası onun əleyhinə əlbir olur

Lakin "İslamın geyim və hicab barəsində nəzəri qeyrət hissinə ehtiram qoymaqdır ya yox?" - sualının cavabında belə demək lazımdır: Şübhəsiz, İslam qeyrət hissindəki fəlsəfəni, yə`ni nəsillərin paklığını qorumağı və onların bir-birinə qarışmamasını nəzərdə tutsa da, İslam hicabını yalnız ona məxsus bilmir. İnşaallah, sonradan buna .toxunacağıq

## İRADLARIN ARAŞDIRILMASI

**İşarə**

Hicab və onun fəlsəfəsini araşdırdıqdan sonra qadın geyimi ilə bağlı irəli sürülən bir :sıra iradları araşdırırıq

**:Hicab və azadlıq .۱**

Deyirlər ki, hicab qadının azadlıq hüququnu əlindər alır və həqiqətdə, bu, onun insanlıq .heysiyyətinə bir növ töhmətdir

**:Cavab**

Öz yerində deyildiyi kimi, mühüm bir məsələ ilə daha mühüm bir məsələ ziddiyyət .۱ təşkil etdikdə, daha mühüm məsələ üstünlük verilir; qadın azadlıq hüququna malik olsa da, onun azadlığı cəmiyyətdə azadlığın aradan getməsinə və fitnə-fəsadın yaranmasına, iş və fəal qüvvələrinin süstlüyünə, habelə öz zərərinə səbəb olarsa, .mütləq onun azadlığı cəmiyyətin azadlığına fəda edilməlidir

Axı, kim deyib ki, qadını qanunsuz cəmiyyətə buraxmaq ona azadlıq bəxş etmək və .۲ ehtiram deməkdir? Halbuki bu iş həqiqətdə ona zülm etmək və ümumiyyətlə, qadını məhv etməkdir. İctimai və fərdi qanunların mənfəəti fərdə və cəmiyyətə aid olduğundan, onun əhatə dairəsini kiçiltməyi heç də azadlıq və ehtirama zidd hesab .etmək olmaz

İslam qadını evdə həbs etmir, əksinə deyir ki, qadın kişi ilə münasibət yaratdıqda, .۳ qadın heysiyyəti və kəramətinin qorunması, eləcə də cəmiyyəti ümumi məsləhətinə görə, əql və İslamın qəbul etdiyi geyimdən istifadə etsin ki, ailə ocaqlarına və ictimai .dəyərlərə zərər yetməsin

Görəsən, hicabmı qadınların azadlığını alır, yoxsa, azadlıq onları məhdudlaşdırır və .۴ .onlara maneçilik törədir? Bu yanlış təsəvvür azadlığın yanlış təsfirindən qaynaqlanır

Bəziləri belə deyir: Azadlıq budur ki, fərd istədiyini yerə yetirdiyi halda, başqalarını narahat etməsin. Görəsən, bu mənanı daşıyan azadlıq insan təbiəti və şəxsiyyəti ilə uzlaşırmı? Görəsən, ümumi mənada instinktual hislərə qapılmaq insan məqamına layiqdirmi? Görəsən, insan istək və qərizələrə qapılmaqla xoşbəxt olarmı? İnsan əql və təfəkkürə malik olan mənəvi bir varlıqdır. Bu baxımdan, nəzərə almaq lazımdır ki, görəsən, fərdi istəkləri təmin etmək insanın şəxsiyyətinin mənəvi yönləri ilə uyğun gəlirmi? Görəsən, insanın əql

qüvvəsi fərdi istəklərin təmin edilməsinə icazə verirmi? Görəsən, insanın ictimai olması ?fərdin bütün istəklərini təmin etməyə icazə verirmi

Azadlığı fərdin bütün istəklərinin təmin edilməsi kimi mənalandırmaq düzgün deyildir. Çünki insanın bəzi istəkləri əsaslı və zəruri deyildir! Bəli, əsaslı istəkləri orta həddə təmin etmək lazımdır. Fərdi istəklərin təmin edilməsi nə insanın səadətinə səbəb olacaq, nə də onun ictimai həyatında xoşbəxtliyini təmin edəcəkdir. Bir sıra istəklərin əsassız olduğu ilə yanaşı fərdi istəklərin də uyğunsuzluğu onların təmin edilməsinə mane törədir və fərdi ziddiyyətə salır. İctimai həyatda insanların istəkləri bir çoxlarını ziddiyyətlərlə üzləşdirir. İctimai həyatda insanlar birgə yaşamalıdırlar. Lakin ictimai .həyat fərdi istəkləri təmin etməklə əsla uyğun gəlmir

Bəzi ictimai filosoflar deyirlər: Azadlıq dedikdə, yalnız əqli azadlıq nəzərdə tutulur. .Nəfsin istəklərinə uyan və təslim olanlar özlərini köləetmişlər

:Qurani-Kərimdə isə belə oxuyuruq

أَفَرَأَيْتَ مَنِ اتَّخَذَ إِلَهَهُ هَوَاهُ

(Ya Peyğəmbər!) Nəfsini özünə tanrı edən və kimsəni gördünmü?(١)“

:İmam Sadiqin (s) belə buyurduğu nəql olunmuşdur



---

.Casiyə” surəsi, ayə: ٢٣“ [١]-١

الهوی عدوّ العقل

(Nəfsi istəklər əqlin düşmənidir.” (۱“

:Həmçinin Peyğəmbəri-Əkrəmdən (s) də belə nəql olunmuşdur

صدیق کل امرء عقله

(Hər bir möminin dostu əqlidir.” (۲“

İslamda təqva ümumi bir fəzilət kimi iman və əqllə qarışmış və insanı Allahın ən bəyənilmiş əmrlərinə itaət üçün hazırlayır. İslam hökmlərinin əqli yönlərinə, həqiqi məsləhət və pozuntular əsasında göndərildiyinə diqqət yetirdikdə, görəəyik ki, insanın məqamı ilə uyğun gələn həqiqi azadlığı onu əsaslı fəzilətlərlə zinətləndirir və .rəzilətlərdən təmizləyir. Bu isə, elə dini təqvanya riayət etməkdir

Azadlığı istər yalnız əqlə itaət mənasında bilsək, istərsə də onu təqva ilə ilgili olduğunu nəzərə alsaq, hər iki surətdə hicab qadının azadlığını məhdud etmədiyi kimi, onun üçün .əqlin təsdiq etdiyi və təqva ilə uyğun gəldiyi bir sıra şərait və zəmin də hazırlayır

Qərbdə qadınları qonaqlıqlarda və ümumi yığıncaqlarda kişilərin ləzzət alması və gözəlliklərini göstərmək üçün gətirirlərsə, bu iş nəinki onların şəxsiyyətini dəyərdən salır, həm də həqiqi azadlığı ondan alır. Qadının azadlığı fikri-ideoloji və mənəvi



---

.Biharül-ənvar”, ۱-ci cild, səh. ۱۳۰“ [۱] -۱

.Yenə orada, ۷۴-cü cild, səh. ۱۷۶ [۲] -۲

qüdrətin inkişafında, tərbiyəvi vəzifələrinin icrası ilə bağlı məlumatlarını .gücləndirməkdə və problemlərin həlli üçün onun məntiqlə iştirakındadır

**:Cinsi təhrik .۲**

Hicaba tutulan iradlardan biri də qadınla kişi arasında sərhəd qoyulmaqla onların bir-birinə qarşı hərisliklərin artmasıdır. “İnsan qadağan olunmuş şeyə həris olur” qaydasına uyğun olaraq hicab qadın və ya kişidə cinsi meyllərə qarşı hərislikləri daha .artırır

Bertrand Rassel yazır: “Məhrumiyyətlər və qadağanların ilkin nəticəsi insanlarda həmin şeylərə qarşı meyllərin təhrik olunmasıdır. Bu təsir də parnoqrafiya və digər (şəkillərdə büruz edir...”(۱

**:Cavab**

ƏVVəLA,_ düzdür ki, məhrumiyyətlər, xüsusilə cinsi qadağanlar xoşagəlməz və_ acınacaqlı halların yaranmasına səbəb olur və təbii ehtiyaclar daxilində qərizələrin tələbi ilə mübarizə aparmaq səhv bir fikirdir, lakin ictimai normaların və sərhədlərin .götürülməsi bu problemi heç də həll etmir, ütsəlik onu artırır

Cinsi ehtiraslarda və bir çox qərizələrdə qayda-qanunların və müəyyən əxlaq normalarının götürülməsi onun həqiqi məfhumuna olan eşqi öldürür, lakin insan təbiətini son dərəcə alçaq və həyasız edir. Bu



---

.Mənim yaşadığım dünya”, ۶۹-۷۰“ [۱] -۱

işə nə qədər geniş meydan verilsə, yeni növlərə olan meyl və həvəslər də bir o qədər artacaqdır. Rasselin özü “Evlənmə və əxlaq” adlı kitabında etiraf edib yazır ki, cinsi məsələlərdəki ruhi yanğı cismi hərarətdən tamamilə fərqlənir. Təmin olunmaqla .sakitləşib təskinlik tapan ruhi yanğı yox, məhz cismi hərarətdir

Cinsi meyllərin azad buraxılması şəhvət hisslərinin son dərəcə hərisləşib şölələnməsinə, daha da qızışmasına səbəb olacaqdır. Lakin bu qərizə barəsində müəyyən məhdudiyyətlərin qoyulması onlarda eşq, romantika və təxəyyül hisslərini ali, lətif, ülvi və insani qüvvə şəklinə salıb inkişaf etdirir. Yalnız belə hallar incəsənətin müxtəlif sahələrinin, bədii əsərlərin və fəlsəfələrin ixtira olunmasına, eləcə də insanın .düzgün yolda addım atmasına, cəmiyyətin və fərdin islahına səbəb ola bilər

Hicaba müxalif olanlar bilmirlər ki, qadını azad buraxmaq, yanğı və təhriklərə məruz qoymaq isanı dəli edir. İnsanın hər bir istəyinin təmin edilməsi mümkün olmadığındn, .onun qərizə və istəyi acınacaqlı şəkildə əzilib, kin-küdurətə səbəb olur

İnsanda olan istəkləri təmin etmək üçün iki şey lazımdır: Biri təbii olaraq istəyi təmin .etmək və digəri yanğı və təhrikin qarşısını almaq

İKINCISI,_ hicab və örpəkdən qaynaqlanan cinsi təhrik düzgün və şəri yolla_ .evlənmək üçün şəhvəti təhrik edə bilər

**:(Qara örpək və çarşabın kərahəti (xoşagəlməzliyi .۳**

Bəziləri belə deyirlər: Qara örpək və geyimin məkruh olması ilə bağlı rəvayətlərin nəql ?olunması ilə yanaşı, nə üçün qara çarşab İslam hicabı kimi tanıtdırılmışdır

Bəzən belə deyirlər: Qara rəng nur və işığı cəzb etdiyindən, adətən, yay fəslində qızları .qara çarşab kimi geyimlərə dəvət etmək düzgün deyildir

Bəzən də iddia edirlər ki, qara məqnəə və qara çarşab kimi geyimlərdən istifadə etmək qadınların sağlamlığına mənfi təsir qoyur və onların sümük xəstəliklərinə .tutulmasına səbəb olur

Həmçinin belə deyirlər: Qara rəngli geyimlərdən təkrar-təkrar istifadə etmək süstlüklə .nəticələnə bilər

**:Cavab**

ƏVVəLA,_ qara geyimin məkruh olmasını bildirən rəvayətlərin sənədi zəifdir._ "Cəvahirül-kəlam" kitabının müəllifi mərhum Ayətullah Xoyi həmin rəvayətlərin (sənədlərinin zəif olduğunu açıq-aşkar bəyan etmişdir.(۱

İKINCISI, _"Cəvahirül-kəlam" kitabının müəllifi qara rəngli geyimin məkruh olması ilə_ bağlı rəvayətləri qadınlara aid bilmir və deyir: "Şiə



---

Cəvahirül-kəlam", ۸-ci cild, səh. ۲۳۳; "Şərhi-Ürvətül-vüsqa", "namaz" kitabı," [۱] -۱ ."namaz qılana məkruh olan libas" bölümü

alimlərinin müxtəlif kitablarında açıq-aşkar bəyan olunduğu kimi, qara geyimin məkruhluğu kişilərə aiddir. Çünki müqəddəs şəriət sahibi qadınların naməhrəmlə üzləşdiyi zaman daha qəliz geyindiyini və özünü daha çox bükdüyünü buyurmuşdur. (Qara rəng digər rənglərlə müqayisədə qəliz və çox bükülü geyimə daha uyğundur.”(١

İçüNCüSü,_ qara rəngli geyim, hətta yay fəslində daha isti olan bəzi məntəqələrdə,_ əsasən, bir qrup qadınlara çətin deyil və bir qrup qızlara çətin olduğunu fərz etsək də, .ona dözmək mümkündür

Möminə qadınlar birinci qrupa aiddir. Onlar qara çarşab və qara çadranı ən üstün geyim bilir və buna möhkəm inanırlar. Odur ki, bu yolda ehtimal verilən bir sıra problemlərdə çətinlik hiss etmirlər. İmam Sadiqdən (ə) nəql olunan rəvayətdə belə :buyurulur

ما ضعف بدن عمّا قويّت عليه النيّه

İnsanın cismi və bədəni niyyət və daxili etiqadla gördüyü işlər müqabilində zəifləmir“ (və çətinlik hiss etmir.”(٢

Rza xanın şahlığı zamanı qadınların başından çarşabın götürülməsi əmri ilə bağlı nəql edirlər ki, bəzi qadınlar möhkəm narahat olduqlarından və şiddətli həyəcan .nəticəsində dünydan getdilər



---

.Cəvahirül-kəlam”, ٨-ci cild, səh. ٢٣٥“ [١]-١

.Mizanül-hikmə”, ١٠-cu cild, səh. ٢٧٠“ [٢]-٢

İkinci qrupa isə o qadınlar aiddir ki, dini-məzhəbi mühitdə olduqları üçün ailə ocaqları və cəmiyyət uşaqlıqdan belə hicaba adət etdilər. Buna görə də, böyüdükdə onlara .qara örpəyin ehtimal verilən çətinliyi ağır gəlmirdi

Psixologiya elminin təlim-tərbiyə ilə əlaqədar adət bölümündə deyilir ki, əgərinsan uşaqlıq çağlarından bir işə adət etsə, böyüdükdə, nəinki ona bu işi görmək çətin olmaz, üstəlik, tərk etdikdə, ona daha ağır gələr. Bu mühüm nöqtə məsum imamların (ə) valideynlərə övladlarını namaz, zikr və uşaqlıqda (günün yarısını) oruc tutmaq kimi (layiqli işlərə adət etdirməklə bağlı tövsiyələrinin sirrini təşkil edir.(١

DöRDüNCüSü,_ yay fəslində bir sıra isti məntəqələrdə bəzi qadınların qara çarşab_ geyinməkləri çətin olsa da, hər bir çətinliyə mütləq şəkildə dözmək ağılasığmaz deyildir. Məsumların göstərişlərinə və insanların həyat təcrübəsinə, eləcə də xarici həqiqətlərə əsasən, dünya həyatının ağrı-acı və məşəqqətsiz xarici vücudu yoxdur. Həzrət Əmirəlmöminin Əli ibn Əbu Talib (ə) dünyanı məşəqqət və möhnət evi (adlandırmışdır.(٢

Dünyanın məşəqqət və ağrı-acılarla birgə olmasının fəlsəfə və sirri odur ki, insan ilahi səadətə çatmaqda təkamül amillərindən sayılan ağrı-acılara dözməyə möhtacdır. Qurani-Kərimin təbirilə desək, ola bilsin ki, insanın xoşlamadığı bir sıra ağır işlərdə



---

.Füruği-kafi”, ٣-cü cild, səh. ۴٠٩, ۴-cü cild, səh. ١٢۴۵“ [١]-١
.Qürərül-hikəm”, Amudi, səh. ١٣١“ [٢]-٢

Allah-taala insan üçün çoxlu xeyir-bərəkət nəzərdə tutsun. Belə ki, buyurulur

فَعَسَى أَن تَكْرَهُواْ شَيْئًا وَيَجْعَلَ اللهُ فِيهِ خَيْرًا كَثِيرًا

Ola bilsin ki, sizdə nifrət doğuran hər hansı bir şeydə Allah (sizdən ötrü) çoxlu xeyir“ ”.nəzərdə tutmuş olsun

Əql də dünya həyatında yüksək və ülvi məqsədlərə nail olmaq üçün bir sıra ağır işlərə .dözməyin yaxşı nəticələr verəcəyinə hökm edir

Əqlin hökmü ilə yanaşı, məsum imamlar da (ə) insanı cimi və ruhi-mənəvi təkamül və səadətə çatmaq üçün ağrı-acılar və nifrət doğruduğu şeylərin müqabilində səbrə :təşviq etmişlər. İmam Həsən (ə) buyurmuşdur

عوّد نفسک التصبر على المكروه

(Nəfsini çətin və nifrət doğuran işlərin müqabilində səbirli olmağa adət etdir!”(١“

BEşINCISI,_ qara çarşabın insan sümüklərinə zərərli olması isə yalnız boş bir iddiadır_ və bu, indiyə qədər hələ də sübuta yetirilməmişdir. Amma bunun əksinə gəldikdə isə, mütəxəssislər qara rəngli geyimlərlə sümük xəstəliklərinin yaranması arasındakı .əlaqəni inkar etmişlər

Doktor Təbatəbai deyir: “Müasir dövrümüzdə qara məqnəə və qara çadra geyinmək (əsla sümük xəstəlikləri yaratmır.”(٢

ALTıNCıSı,_ qara geyimin süstlüyə səbəb olması haqda_



---

.Nəhcül-bəlağə”, ٣١-ci məktub“ [١]-١

.İran” qəzeti, ١٣٧٩-cü il, şəhrivər ayının ٢٨-i“ [٢]-٢

deməliyik ki, bu da heç bir elmi mənbəyə qaynaqlamayan boş iddiadan başqa bir şey deyildir. Əksinə psixoloqlardan birinin nəzəri belədir: "Kişi və ya qadınların evdən çıxarkən qara geyinməsi onların süstülüyünə, yaxud ruhi-psixi xəstəliyinə səbəb olması haqda deyilən sözlər tamamilə yanlış və elmi əsası yoxdur."(۱) Bəzi psixoloqların nəzərinə görə, bəzilərinin süstlüyünə səbəb onların qara geyimlərə meylli olsa da, insanların qara geyimləri süstlüyə səbəb deyildir.

Doğrudan da, süstlük çox geniş yayılmış ruhi-psixi bir xəstəlik kimi, müxtəlif amilləri, əlamətlərlə yanaşı, hətta ziddiyyətli zahiri rəftarları da vardır. Odur ki, bir sıra araşdırmalarla bu müddəanı sübut etmək çətindir.

Qara çarşabdan istifadə etmək mənfi təsirləri olmadığı kimi, naməhrəm müqabilində hicab və qadın geyiminin fəlsəfəsi ilə, başqa sözlə, cəmiyyətdə ruhi-psixi aramlıqla da uyğun gəlir. Bu gün rənglər psixologiyasında qara rəngin hərəkətsiz və qeyri-fəal olması, təhrikə səbəb olmaması və diqqəti özünə cəlb etməməsi inkaredilməz bir həqiqətdir.

"Rənglər psixologiyası" kitabında qara rəng haqqında belə yazılır: "Qara rəng mütləq sərhəd göstəricisidir."(۲) Beləliklə, evdən çıxarkən naməhrəm müqabilində qara çarşab geyinən qadın əməli ilə özü ilə naməhrəm şəxs



---

۱- [۱] Doktor Bürhani, əsəb həkimi, ۱۹-u dey jurnalı, ۱۱۵-ci sayı.

۲- [۲] "Rənglər psixologiyası", Doktor Maks Luşter, tərcümə: Vida Əbizadə, səh. ۹۷.

arasında mütləq və kamil sərhəd yaradır. Qadın evdən çıxarkən başına qara çadra və çarşab atırsa, bildirmək istəyir ki, naməhrəm mənə yaxınlaşa bilməz. Çünki bu geyim .həyasızlıq və təhrik yox, iffət və həya geyimidir

Həmçinin rənglər psixologiyasında qara rəng “yox” mənasını daşıyır və “bəli” sözünün, (yəni ağ rəngin əks nöqtəsidir.[١]

Beləliklə, qara çarşab geyinən qadınlar naməhrəmlə üzləşdikdə, həqiqətdə ona “yox” demək istəyir. Buna əks olaraq rəngarəng və cəzbedici libaslar geyinənlər isə istər-istəməz özünü aludə baxışlar məruz qalırlar. Psixoloji baxımdan da, insan qara parça gördükdə, ona elə də rəğbətlə baxmır və öz-özünə üzünü çevirir. Bunun müqabilində isə açıq rənglər gözü açır və ona baxmaq rəğbəti yaranır. Qadınların açıq və .rəngarəng libaslardan istifadə etməsi də naməhrəm kişilərin diqqətini özünə cəlb edir

Hörmətli müəllifin sözlərinə diqqət etdikdə aydın olur ki, onun təkcə məqsədi qara) rəngli çarşabı məhkum edən insanları susdurmaq olmuşdur. Bu da o demək deyil ki, qaradan başqa rənglərdən və yaxud çarşabdan fərqli formalı modern islami (.hicablardan istifadə etmək yasaqdır



---

.Yenə orada [١]-١

## AÇIQ–SAÇIQLIQ VƏ YARIMÇILPAQLIĞIN AMİLLƏRİ

**İşarə**

Çoxları elə təsəvvür edir i, müasir dünyada qadının ictimai fəaliyyətlərdə açıq-saçıq olması bəşəri inkişafa və yeni sivilzasiyaya doğru aparır. Lakin bu səthi və sadəlövhlüklə birgə olan nəzərin puç olması qısa tədqiqatla aydınlaşır. İndi isə müasir :mütərəqqi dünyada açıq-saçıqlığın zəmin və səbəblərinə işarə edirik

**:Azadlıqdan başa düşülən yanlış məna .۱**

Müsasir dünyada qadının ictimai fəaliyyətlərində açıq-saçıq və yarımçılpaqlığının ilkin zəmini və səbəbi azadlıqdan başa düşülən yanlış məna və təfsirdir. Dünya yanlış təfsirə əsasən, qadını açıq-saçıqlığa çəkmiş və ana çıq-saçıqlıq fenomenini yükləmişdir. Həmin yanlış təfsir budur ki, insan yalnız heyvani üönlər və maddi həyatda yekunlaşır. Odur ki, var qüvvəsi ilə çalışıb, istəkləri uğrunda

bütün vasitələrdən maksimum istifadə etməlidir. Nəfsin istəklərinə mane olmamaq və .bütün təmayüllərdən ləzzət almaq azadlıq adı ilə yanlış bir məfhum kimi yayıldı

Azadlıqdan başa düşülən yanlış məna səbəb oldu ki, kişi və qadın münasibətlərinə hədd-hüdud təyin olunmadı, yanlış məfhumu bildirən azadlığı gerçəkləşdirmək üçün açıq-saçıqlıq və yarımçılpaq fenomeni qadına yükləndi. Həqiqətdə, bu yanlış mənaya əsasən, bu məna qadını azad etmək əvəzində onu kişinin ləzzətləri yolunda .xidmətçiyə çevirdilər

**:Qadının təhqir edilməsi .۲**

Qərb dünyasında açıq-saçıqlığın amillərindən biri də qadının təhqirə məruz qalması və onun qərb cəmiyyətində məhrumiyyətinin artmasıdır. Əgər eşitsək ki, hətta qərb alimləri və filosofları bir müddət öncə qadının təhqir edilməsinə israr etmişlər, təəcüblü deyildir! Bəli, qadının təhqirə məruz qalması sərt bir əks-əməl kimi açıq-saçıqlıqla .nəticələnmişdir

Əflatun deyir: "Mən iki xüsusiyyətə malik olduğum üçün şükr edir və sevinirəm: ".birincisi, azad insanam, ikincisi isə kişiyəm

Məşhur alman filosofu Şupen Haver deyir: "Qadın uzun saçlara və kiçik ağıla malik bir ".heyvandır

Başqa bir məşhur alman filosofu Niçə isə deyir: "Qadın yalnız kişiyə rahatlıq verən və ".döyüşçüyə ləzzət bəxş edən bir varlıqdır

səh:۹۸

Məşhur fransız yazıçısı və mütəfəkkiri Balzak deyir: “Qadının yeganə vəzifəsi və fəxri kişinin qəlbinin döyüntüsünün sürətini artırmaqdır.”(۱)

Keçmişdə qadının tarixi təhqirə məruz qalması qərb dünyasında artıq məhrumiyyət və qadağanlarla qarışdı və bir əks-əməl kimi açıq-saçıqlıq fenomeninə səbəb oldu. Halbuki İslam dini qadını yüksək dəyərləndirmişdir.

**۳. İqtisadi inkişaf:**

Kütləvi istismar və maddi mənafe kimi bütün zəminlərdə iqtisadi rəqabətlərlə birgə qərbə hakim kəsilən iqtisadi inkişaf qadının azad ticarət və iqtisadda təbliğat vasitəsi kimi istifadəsinə səbəb oldu. Qərblilər qadından əmtəələrinin satılması və yeri bazarların yaradılması üçün təbliğat vasitəsi kimi bəhrələndilər. Bu istiqamətdə qadının şəxsiyyətini təhqir etməyə başladılar, onudəyərsiz bir vasitə kimi şəxsi mənafeləri yolunda kiçilitdilər.

**۴. Təbliğat dairələrinin təsiri:**

Müəyyən bir kateqoriyanın fitri olması təbliğat dairələrinin onun xeyir və zərəri ilə bağlı təsirinə mane olmur. Necə ki, hicabın fəlsəfəsinin düzgün təbliği onun geniş yayılmasında mühüm rol oynayır. Lakin müxaliflərin şübhələri, zəhərləri və əks



---

۱- [۱] “Hicab və azadi”, səh. ۶۷.

təbliğatları da hicab mədəniyyətinin geridə qalmasındakı mühüm rolu inkaredilməzdir. Müxtəlif şahidlər də göstərir ki, istemarçıların İslam ölkələrinə nüfuz etməsi üçün ən mühüm taktikalarından biri də açıq-saçıqlıq və yarımçılpaqlığı genişləndirməklə fitnə-fəsadları yayması idi.

İngiltərənin istismarçı casusu Mister Hemfer deyir: “Qadınların açıq-saçıqlıq məsələsi üzərində elə çalışmalıyıq ki, müsəlman qadınlar çarşabı atıb açıq-saçıqlığa rəğbət bəsləsinlər. Geniş təbliğatlar nəticəsində hicab götürüldükdən sonra bizim məmurlarımızın vəzifəsi cavanları qadınlarla qeyri-qanuni cinsi rabitələrə təşviq etmək və beləcə, fəsad və əxlaqi pozuntuları İslam cəmiyyətində yaymaqdır. Bunun üçün qeyri-müsəlman qadınlar küçə-bazarlarda açıq-saçıq gəzməlidir ki, müsəlman qadınlar da onlara baxım hicablarını götürsünlər.”(١)

Frantes Fanun istemarçı Fransa dövlətinin Əlcəzayir İslam ölkəsində hicaba qarşı mübarizəsi haqda belə deyir: “Fransanın Əlcəzayirdə mədəniyyətə zidd gördüyü ilk addımı hicabı aradan aparmaq idi. Onlar bu işdə müvəffəq oldu və əlcəzayirli qadınların açıq-saçıqlığını nə qədər genişləndirirdilərsə, bir o qədər də Əlcəzayiri müstəmləkə çaynağında saxlaya bilirdilər. Lakin



---

١-[١] “Mister Hemferin xatirələri”, tərcümə: Doktor Möhsin Müəyyidi, səh. ٨۴.

Əlcəzayir qadınları öz şəxsiyyətlərini yenidən tapdı və müstəmləkə caynağı ilə (mübarizəyə qalxdılar.”(١

Yenə də belə deyir: “Hər dəfə bir çarşab kənara atıldıqda, istemarçılara yeni bir üfüq açılırdı. Onlar açıq-saçıq və çılpaq olan hər bir bədəni görəndə, işğalçılıq şövqü ilə (ümidləri on qat artırdı.”(٢

#### :Qərbin insana xüsusi baxışı .۵

Qərbdə yarımçılpaqlığın əsas amillərindən biri də əksər qərblilərin insan haqda xüsusi baxış və nəzəridir. Onların nəzərində insan meymundan törənmiş və təbiət aləmində .inkişaf edərək kamal mərhələsinə çatmışdır

Məşhur ingilis bioloqu Carlez Darvin təkamül teoriyasını irəli sürməklə insanın təbiət seçimi nəticəsində heyvandan və özündən aşağı dərəcədə olan varlıqdan törəndiyini bildirdi. Onun nəzərincə, insanın özündən aşağı olan heyvanlardan kamil olmasına səbəb olan bir sıra xüsusiyyətləri müstəsna etməklə onun digər heyvanlarla əsaslı .fərqi yoxdur

Bu təhlilə əsasən, insan keçmişdə də güman edildiyi kimi, zatən şərəfli və kəramətli deyil və digər heyvanlardan fərqlənmir. Sadəcə olaraq bəzi heyvanlar kimi, tədriclə təkamül mərhələsinə çatmışdır. Bəli, insan haqqında belə nəzər və görünüşə sahib olanlar



---

.Hərimi-ifaf, hicab və neqah”, Hüseyniyan, səh. ۴٨. ondan nəqlən“ [١]-١

.Qadın” jurnalı, ١٣٧١-ci ilin bəhmən ayı, səh. ٣۴“ [٢]-٢

heç vaxt örpəyə əsla əhəmiyyət verməyəcəklər, öz köklərinə qayıdaraq çılpaq gəzməyə üstünlük verəcəklər. Halbuki bu nəzər öz yerində geniş şəkildə rədd edilmiş və insanın ilk cövhərinin əql, təfəkkür və nəfsani kəramətlə birgə insaniyyətdən başqa .bir şey olmadığı sübuta yetirilmişdir

Qurani-Kərim ayələrinə görə, isan həzrət Adəm (ə) və həzrət Həvvadan dünyaya gəlmiş və onların da Allah tərəfindən dəmilən ruhla birgə torpaq və gildən yaranmışlar. .Bundan sonra behiştdən çıxarılmış və dünyada yaşayaraq nəsil artırmışlar

:Mütəal Allah buyurur

يَا أَيُّهَا النَّاسُ اتَّقُواْ رَبَّكُمُ الَّذِى خَلَقَكُم مِّن نَّفْسٍ وَاحِدَةٍ وَخَلَقَ مِنْهَا زَوْجَهَا وَبَثَّ مِنْهُمَا رِجَالاً كَثِيرًا وَنِسَآءً

Ey insanlar! Sizi tək bir şəxsdən (Adəmdən) xəlq edən, ondan zövcəsini (Həvvanı)“ (yaradan və onlardan da bir çox kişi və qadınlar törədən Rəbbinizdən qorxun!”(١

:Başqa bir ayədə buyurur

الَّذِى أَحْسَنَ كُلَّ شَىْءٍ خَلَقَهُ وَبَدَأَ خَلْقَ الْإِنسَانِ مِن طِينٍ. ثُمَّ جَعَلَ نَسْلَهُ مِن سُلَالَةٍ مِّن مَّاء مَّهِينٍ

O, yaratdığı hər şeyi gözəl yaratdı, insanı (Adəmi) yaratmağa palçıqdan başladı. Sonra “ (onun nəslini nütfədən - bir qətrə zəif (dəyərsiz) sudan əmələ gətirdi.”(٢

:Həmçinin buyurur

يَا بَنِى آدَمَ لاَ يَفْتِنَنَّكُمُ الشَّيْطَانُ كَمَا أَخْرَجَ أَبَوَيْكُم مِّنَ الْجَنَّةِ ...



---

.Nisa” surəsi, ayə: ١“ [١] -١

.Səcdə” surəsi, ayə: ٧-٨“ [٢] -٢

Ey Adəm oğulları! Şeytan ata-ananızı  Cənnətdən qovdurduğu kimi, sizi də aldadıb“ (yoldan çıxartmasın.”(١)

:Yenə də buyurur

وَإِذْ قَالَ رَبُّكَ لِلْمَلاَئِكَهِ إِنِّی خَالِقٌ بَشَرًا مِّن صَلْصَالٍ مِّنْ حَمَإٍ مَّسْنُونٍ. فَإِذَا سَوَّيْتُهُ وَنَفَخْتُ فِيهِ مِن رُّوحِی فَقَعُواْ لَهُ سَاجِدِينَ

Ya Rəsulum!) Xatırla ki, bir zaman Rəbbin mələklərə belə demişdi: “Mən quru və )“ qoxumuş (dəyişib başqa şəklə düşmüş) qara palçıqdan insan yaradacağam! Mən ona surət verib ruhumdan üfürdüyüm zaman siz ona (ibadət yox, təzim məqsədilə) səcdə (edin!” (٢)

:İslam insanı Allahın saleh canişini tanıtdırır. Qurani-Kərimdə bu haqda buyurulur

وَإِذْ قَالَ رَبُّكَ لِلْمَلاَئِكَهِ إِنِّی جَاعِلٌ فِی الأَرْضِ خَلِيفَهً...

Ya Rəsulum, yadına sal ki,) sənin Rəbbin mələklərə: “Mən yer üzündə bir xəlifə )“ ((canişin) yaradacağam!” - dedi...”(٣)

səh:١٠٣

---

.Əraf” surəsi, ayə: ٢٧“ [١]-١

.Hicr” surəsi, ayə: ٢٨-٢٩“ [٢]-٢

.Bəqərə” surəsi, ayə: ٣٠“ [٣]-٣

## HİCABSIZLIĞIN ACINACAQLI NƏTİCƏLƏRİ

### İşarə

Yarımçılpaqlığın cəmiyyətə və ailəyə dəhşətli və acınacaqlı nəticələri vardır ki, biz :burada onların bir neçəsini qeyd edəcəyik

### :Ailə ocaqlarının təhdid edilməsi .۱

Hər hansı bir cəmiyyətdə qadınlar öz gözəlliklərini göstərirsə, təhrikedici bədənlərini nümayiş etdirirsə, sözsüz, orada nəfsin istəklərinə uymaq, ehtiraslara yönəlmək də artacaq və insani keyfiyyətlərə və əxlaqi fəzilətlərin yeganə səbəbi olan və nəticəsi həqiqi eşq sayılan dini-mənəvi dəyərlər aradan gedəcək və ya azalacaq və beləcə, cəmiyyətin fərdləri, qadınlar və həyat yoldaşları arasında bəyənilmiş fəzilətlər inkişaf etməyəcək, hətta nalayiq sifətlər belə artacaq. Nəticədə eşq və məhəbbətin əsası sarsıdılacaq. İffətli, pak, qeyrətli və mömin həyat yoldaşları olan iffətli və örpəkli qadınlar

müstəsna olmaqla, digər qadınların ictimai sevgisi və ailə ocaqlarında sevimli məqamı süqut edəcək, oyun-oyuncaq və əyləncəyə, eləcə də kişilərin ehtiraslarının təmin .edilməsi üçün bir vasitəyə çevriləcək

Belə qadınlar öz şəxsiyyət və sevgisinə, habelə digər qadınlara ən böyük zərbə endirir ki, onun acınacaqlı nəticəsi kişilər tərəfindən əzab-əziyyət, haqsızlıq və onların insani-milli hüquqlarına, şəxsiyyətinə diqqətsizlik, ailə ocaqlarında yaranan ixtilaf, narahatlıq, .iztirab və həyəcandır. Bir çox hallarda da ailə ocaqlarının boşanma ilə dağılmasıdır

**:Namus və dini qeyrət hissinin zəiflədilməsi .۲**

Qeyrət, ilahi və insani fəzilətlərdən biri kimi, həmişə Allahın namusunu (dinini) və şəriətini və həmçinin insanın namusunu azğın amillər müqabilində qoruyub-saxlayır və nəhayət, insani şərəfin davamına, ictimai təhlükəsizliyə, pak nəslə səbəb olur. Dini qeyrətin nişanəsi ilahi maarif və dini-məzhəbi dəyərlərin yayılıb nəşr edilməsi uğrunda fədakarlıq, əmr be məruf (yaxşılığa dəvət), nəhy əz münkər (çirkinlikdən çəkindirmək), .puç dəyərlər və azğınlıqlarla mübarizədir

Namusla bağlı qeyrətin nişanəsi isə, həmişə cəmiyyətin və öz ailəsinin iffət və paklığını qorumaq, cəmiyyət və ailənin iffət və paklığını ləkələyən amillərdən xəbərsiz olmayıb, onlarla mübarizə aparmıq, həmçinin həyat yoldaşı və qızlarının dini

geyiminə hörmətsizlik nətsicəsində onların şəxsiyyətinə endirilən zərərlərə, ümumi və xüsusi məkanlarda onların kişilərlə qarışmasına, naməhrəmlərlə, hətta qohumlarla zarafat etməsinə, dünya və ehtiras düşkünlərinin əyləncə alətinə çevrilməsinə mane olmaq, nəsillərin paklığı və yarımçılpaqlıqdan qaynaqlanan zina ilə mübarizə uğrunda .var qüvvə ilə çalışmaqdır

**:Psixi–əsəbi gərginliklərin baş qaldırması .۳**

Ruhi xəstəliklər və psixi-əsəbi gərginliklər bir sıra amillərdən qaynaqlanır ki, onların əsas kökünü təhrikedici yerlərdə və qadınların özlərini nümayiş etdirməsində arayıb-.axtamaq lazımdır

Ehtiraslı həyəcanlar, əsəbi və instinktual sıxıntılar bir tərəfdən açıq-saçıq gəzən qadınların cəzbedici və təhrikedici mənzərələrinin nəticəsi, digər tərəfdən isə cinsi istəklərin təmin edilməsinin qarşısının alınmasından baş qaldıran qadağanların hissi edilməsidir. Bunun hər hansı biri insan ruhuna və əsəb sisteminə ağır zərbələr endirir .və nəhayət, ruhi-psixi gərginliklərə və çismi-əsəbi xəstəliklərə gətirib çıxarır

**:Cinsi azğınlıqların artması .۴**

Göz və təxəyyülün idarəsi, hicab, iffət və qeyrət, ümumiyyətlə, cinsi əxlaq barəsində İslam göstərişləri insanın əxlaqi pozuntulardan, cinsi azğınlıqlardan, cəmiyyətdə qadınların açıq-saçıqlıq və

yarımçılpaqlıq və laqeydliyindən nəşət tapan zina və həmcinsbazlıqdan (homoseksual) .qorunması məqsədilə nəzərdə tutulmuşdur

Düzgün öprəyə və İslam qayda-qanunlarına riayət etməyən qadın cəmiyyətdə gəzib-dolanmaqla qəflətə, ilahi göstərişlərin unudulmasına, cəmiyyətdə ürəklərin kor olmasına səbəb olacaq. Qadınların cinsi və şəfqəti baxımdan kişilərə təsiri ucbatından özlərini onların könüllərinə giriftar edəcək, ehtiraslarını şö`ləndirəcək. Onun acınacaqlı nəticələri isə cinsi azğınlıqların və cismi-ruhi ağrı-acıların şiddətlə artmasıdır .ki, çox vaxt insanı qara günə salır və həyatını məhv edir

Geyiminə fikir verməyən qadın cəmiyyətdə və naməhrəm şəxslərin müqabilində açıq-sayıq gəzib-dolanması ilahi hökmə qarşı çıxaraq onun üçün günah yazılacaq və onun vasitəsilə haram baxışlara, laqeydliyə, cinayətə, haqsızlığa və digər pozğunluqlara əl atanların günahına da şərik olacaq və nəhayət, bərzəx və axirət aləmində, bə`zən də elə bu dünyada öz iffətsiz rəftarlarının və qeyri-münasib geyiminin əks-əməlinə düçar .olacaq

Bunlardan əlavə, iffətə zidd olan bu əməllərin və onların acınacaqlı nəticələrinin geniş yayılması nəticəsində ilk növbədə açıq-saçıq və yarımçılpaq qadınların özləri oyunu .uduzur və qurban olurlar

**:Bəla və müsibətlərin nazil olunmasına səbəbi .۵**

Bəzi qadınların əql, fitrət, vəhy və şəriətin göstəriş verdiyi

iffət və örpəyə etinasızlığı nalayiq əməllərdən və böyük günahlardan sayılır. Onun ictimai pozuntuları ilə yanaşı, həmin qadınları acınacaqlı nəticələr də gözləyir. Onlar hidayət çırağı, öyüd-nəsihət, lütf və mərhəmət, əfv və güzəştdən sui-istifadə vasitəsilə anlamadıqda, mərhəmətli Allah onları öz çirkin və nalayiq əməl və rəftarlarının, cəmiyyətdə qurşandıqları aşkar günahlarının acınacaqlı təsir və aqibətinə düçar edəcək, cəzalandıracaq, göz, can, övlad, abır-heysiyyət, mal-dövlət müsibətinə giriftar edəcək ki, bəlkə də ayılıb agah olsunlar, iffət, təqva və ilahi itaət yolundu addım .atsınlar

**:Cəmiyyətdə dinsizliyi yaymaq .۶**

Cəmiyyətdə həyatın yüksək hədəf və məqsədinin itməsini göstərən qadınların özünü göstərməsi və yarımçılpaq olması kişiləri də həyat və yaradılış məqsədindən yayındırır, maddiyyata, ehtirasa, fitnə-fəsada və çirkin əxlaqa qərq edir. Bu isə ürəyin qaralması .və sərtləşməsinə səbəb olur

Bundan əlavə, belə zərərlərə məruz qalan qadınlar da yaddaşlardan silinərək öz dəyərli mahiyyətini itirəcək, İslam örpəyi kimi dəyərli bir geyimə qarşı hörmətsizlikdən qaynaqlanan böyük günahlara, cinayət və inhiraflara düşəcək, qəlb və ruh paklığını, nuraniliyini, emosional hisslərini əldən verəcək və ruhi-psixi gərginliyə düçar olacaqdır. Bunun nişanələrindən biri onların öz qadınlıq dəyərlərinin alt-üst edilməsinə, ailə ocaqlarının dağılmasına, cavanların və

yeniyetmələrin azğınlığa düşməsinə, açıq-saçıqlıq və yarımçılpaqlığın digər acınacaqlı nəticələrinə, ümumiyyətlə, başqaları üçün hazırlanan yanlış ləzzətlərin möhkəmlənməsinə əsla əks-əməl göstərməməsi və biganə yanaşmasıdır. Odur ki, onların iffətli örpəyin zərurəti ilə bağlı ilahi göstərişlərə, naməhrəmlər müqabilində əxlaqi normalara və yaxşı öyüd-nəsihətlərə diqqət yetirməməsi öz səmavi .şəxsiyyətlərinə əhəmiyyətsiz yanaşmasına bir nişanədir

**:Həqiqətaxtaran vicdanın aradan getməsi .۷**

İnsan fitrətən, həqiqətaxtaran və həqiqətbindir. O, təfəkkür, elm və bilik öyrənmək, .dünyanın həqiqətlərini tanımaq sayəsində çiçəklənir və tədriclə təkamülə çatır

İnsan elm öyrənmək, əqli istedadlarını, yüksək fəzilətlər və kamallara çatmağın ayrılmaz hissəsi sayılan həqiqətaxtarma fitrətini artırmaq üçün fikri aramlığa, şövq və rəğbətə möhtacdır. Halbuki cavanlar və yeniyetmələr laqeyd və yarımçılpaq qadınlarla, təhrikediici səhnələrlə üzləşməsi belə halların azalması və yaxud aradan getməsində mühüm amillərdən biri kimi onlara və ailə ocaqlarına ağır bəla və zərbələr endirir. Nəticədə cəmiyyətdə elmi istedadların inkişafına mane yaranır, günah və cinsi azğınlıqlara meyl və kor-korana təqlidlərə yönəliş artır, yüksək qadınlıq dəyərləri .sarsıdılır və qadınla səviyyəsiz varlıq kimi rəftar edilir

## QUR`ANİ–KƏRİMDƏ HİCAB

:Qur`ani-Kərimin bir neçə ayəsində hicab və örpək məsələsinə toxunulmuşdur

:Nur” surəsinin ۳۰-۳۱-ci ayələrində buyurulur“ .۱

قُل لِّلْمُؤْمِنِينَ يَغُضُّوا مِنْ أَبْصَارِهِمْ وَيَحْفَظُوا فُرُوجَهُمْ ذَلِكَ أَزْكَى لَهُمْ إِنَّ اللهَ خَبِيرٌ بِمَا يَصْنَعُونَ. وَقُل لِّلْمُؤْمِنَاتِ يَغْضُضْنَ مِنْ أَبْصَارِهِنَّ وَيَحْفَظْنَ فُرُوجَهُنَّ وَلَا يُبْدِينَ زِينَتَهُنَّ إِلَّا مَا ظَهَرَ مِنْهَا وَلْيَضْرِبْنَ بِخُمُرِهِنَّ عَلَى جُيُوبِهِنَّ وَلَا يُبْدِينَ زِينَتَهُنَّ إِلَّا لِبُعُولَتِهِنَّ أَوْ آبَائِهِنَّ أَوْ آبَاء بُعُولَتِهِنَّ أَوْ أَبْنَائِهِنَّ أَوْ أَبْنَاء بُعُولَتِهِنَّ أَوْ إِخْوَانِهِنَّ أَوْ بَنِي إِخْوَانِهِنَّ أَوْ بَنِي أَخَوَاتِهِنَّ أَوْ نِسَائِهِنَّ أَوْ مَا مَلَكَتْ أَيْمَانُهُنَّ أَوِ التَّابِعِينَ غَيْرِ أُوْلِي الْإِرْبَةِ مِنَ الرِّجَالِ أَوِ الطِّفْلِ الَّذِينَ لَمْ يَظْهَرُوا عَلَى عَوْرَاتِ النِّسَاء وَلَا يَضْرِبْنَ بِأَرْجُلِهِنَّ لِيُعْلَمَ مَا يُخْفِينَ مِن زِينَتِهِنَّ وَتُوبُوا إِلَى اللهِ جَمِيعًا أَيُّهَا الْمُؤْمِنُونَ لَعَلَّكُمْ تُفْلِحُونَ.

Ya Rəsulum!) Mömin kişilərə de ki, gözlərini haram edilmiş şeylərdən çevirsinlər)“ (naməhrəmə baxmasınlar), ayıb yerlərini (zinadan) qorusunlar (və ya örtülü saxlasınlar). Bu onlar üçün (ədəb-ərkan, təmizlik baxımından) daha yaxşıdır. Şübhəsiz ki, Allah onların nə etdiklərindən xəbərdardır! Mömin qadınlara de ki, gözlərini

səh:۱۱۱

haram buyurulmuş şeylərdən çevirsinlər (naməhrəmə baxmasınlar), ayıb yerlərini (zinadan) qorusunlar (və ya örtülü saxlasınlar); öz-özlüyündə görünən (əl, üz) istisna olmaqla, zinətlərini (zinət yerləri olan boyun, boğaz, qol, ayaq və s. naməhrəmə) göstərməsinlər; baş örtüklərini yaxalarının üstünə çəksinlər (boyunları və sinələri görünməsin); zinət yerlərini ərlərindən, yaxud öz atalarından, yaxud ərlərinin atalarından (qayınatalarından), yaxud öz oğullarından, yaxud ərlərinin oğullarından, yaxud öz qardaşlarından, yaxud qardaşlarının oğullarından, yaxud bacılarının oğullarından, yaxud öz (müsəlman) qadınlarından, yaxud sahib olduqları (müşrik) cariyələrdən, yaxud kişiliyi qalmamış (onlarla birlikdə yemək yeyən) xidmətçilərdən, yaxud qadınların məhrəm yerlərini hələ anlamayan uşaqlardan başqasına göstərməsinlər; gizlətdikləri bəzək şeylərini (xalxallarını) göstərmək üçün ayaqlarını (yerə və ya bir-birinə) vurmasınlar. Ey möminlər! Hamınız Allaha tərəf qayıdın ki, nicat tapasınız!”

٢. “Əhzab” surəsinin ٥٩-cu ayəsində belə buyurulur:

يَا أَيُّهَا النَّبِيُّ قُل لِّأَزْوَاجِكَ وَبَنَاتِكَ وَنِسَاء الْمُؤْمِنِينَ يُدْنِينَ عَلَيْهِنَّ مِن جَلَابِيبِهِنَّ ذَلِكَ أَدْنَى أَن يُعْرَفْنَ فَلَا يُؤْذَيْنَ وَكَانَ اللهُ غَفُورًا رَّحِيمًا

“Ya Peyğəmbər! Zövcələrinə, qızlarına və möminlərin qadınlarına de ki, (evdən çıxdıqda

cariyələrə oxşamasınlar deyə, bədənlərini başdan-ayağa gizlədən) örtüklərini örtsünlər. Bu onların tanınması (cariyə deyil, azad qadın olduqlarının bilinməsi) və onlara əziyyət verilməməsi üçün daha münasibdir. (Əgər indiyə qədər bir xətaya yol veriblərsə, tövbə etsinlər ki,) Allah bağışlayan və rəhm edəndir!"

۳. Başqa bir ayədə Peyğəmbəri-Əkrəmin zövcələrinə xitabən buyurulur:

يَا نِسَاءَ النَّبِيِّ لَسْتُنَّ كَأَحَدٍ مِّنَ النِّسَاءِ إِنِ اتَّقَيْتُنَّ فَلَا تَخْضَعْنَ بِالْقَوْلِ فَيَطْمَعَ الَّذِي فِي قَلْبِهِ مَرَضٌ وَقُلْنَ قَوْلًا مَّعْرُوفًا. وَقَرْنَ فِي بُيُوتِكُنَّ وَلَا تَبَرَّجْنَ تَبَرُّجَ الْجَاهِلِيَّةِ الْأُولَى...

"Siz ey Peyğəmbərin zövcələri! Allahdan qorxacağınız təqdirdə siz (başqa) qadınların heç biri kimi deyilsiniz. (Sizin qədir-qiymətiniz, məqamınız daha yüksəkdir. Allahdan qorxsanız, daha şərəfli olarsınız). Buna görə də (yad kişilərə) yumşaq (əzilə-əzilə) danışmayın, yoxsa qəlbində mərəz (şəkk, nifaq və günah mərəzi) olan tamaha (özgə təmənnaya) düşər. (Danışdığınız zaman) gözəl danışın! (Allahın buyurduğu kimi, yaxud qəbul olunmuş qayda üzrə gözəl, ciddi bir söz deyin!) Evlərinizdə qərar tutun. İlkin cahiliyyət dövründəki kimi açıq-saçıq olmayın..."(۱)

Bu ayədə Peyğəmbəri-Əkrəmin (s) zövcələrinə buyurulan vəzifə və tapşırıqlar yalnız onlara aid



---

۱- [۱] "Əhzab" surəsi, ayə: ۳۲-۳۳.

deyil, hətta digər qadınlara şamildir. Çünki heç kim bu ayənin yalnız o həzrətin zövcələrinə aid olduğunu iddia etmədiyi kimi, digər ayələrdə də müsəlman qadınlar .iffət, örtük və İslam əxlaqına də`vət olunurlar

:Başqa bir ayədə də belə buyurulur .۴

وَالْقَوَاعِدُ مِنَ النِّسَاء اللَّاتِي لَا يَرْجُونَ نِكَاحًا فَلَيْسَ عَلَيْهِنَّ جُنَاحٌ أَن يَضَعْنَ ثِيَابَهُنَّ غَيْرَ مُتَبَرِّجَاتٍ بِزِينَةٍ وَأَن يَسْتَعْفِفْنَ خَيْرٌ لَّهُنَّ

Heyzdən və doğuşdan kəsildikləri üçün) ərə getməyə ümidi qalmayan yaşlı)“ qadınların qadağan olunmuş zinətlərini (zinət yerlərini naməhrəmə) göstərmədən üst paltarını (çarşablarını) çıxarmasında günah yoxdur. Bununla belə, özlərini örtmələri (onlar üçün daha yaxşıdır!”(۱)

Bu ayədən başa düşülür ki, bu ünvana daxil olmayan qadınlar özlərini naməhrəm .kişilərin gözündən örtməli və örpəklərinə layiqincə riayət etməlidirlər

Ayədə qeyd olunan “vəl-qəvaidu minən-nisa”- tə`birində yaşlı və qadınlıq baxımından qoca sayılan, başqa sözlə, cinsi nöqteyi-nəzərindən kişinin diqqətini cəlb etməyən .qadınlar nəzərdə tutulur

Ən yəzə`nə siyabəhunnə...” (üst paltarlarını çıxarmasında...) - təbiri qadınların iki növ“ geyimlərinə dəlalət edə bilər: ۱. Çöl geyimi; ۲. Ev geyimi. Yuxarıdakı ayədə yaşlı və qoca qadınlara evdən çölə



---

.Nur” surəsi, ayə: ۶۰“ [۱]-۱

çıxında çöl geyimlərini, yaxud çarşablarını geyməmək icazə verilsə də, öz zinətlərini və .zinət yerlərini naməhrəmlərdən mütləq örtməlidirlər

:Yenə başqa bir ayədə buyurulur .۵

يَا أَيُّهَا الَّذِينَ آمَنُوا لَا تَدْخُلُوا بُيُوتَ النَّبِيِّ إِلَّا أَن يُؤْذَنَ لَكُمْ إِلَى طَعَامٍ غَيْرَ نَاظِرِينَ إِنَاهُ وَلَكِنْ إِذَا دُعِيتُمْ فَادْخُلُوا فَإِذَا طَعِمْتُمْ فَانتَشِرُوا وَلَا مُسْتَأْنِسِينَ لِحَدِيثٍ إِنَّ ذَلِكُمْ كَانَ يُؤْذِي النَّبِيَّ فَيَسْتَحْيِي مِنكُمْ وَاللَّهُ لَا يَسْتَحْيِي مِنَ الْحَقِّ وَإِذَا سَأَلْتُمُوهُنَّ مَتَاعًا فَاسْأَلُوهُنَّ مِن وَرَاءِ حِجَابٍ ذَلِكُمْ أَطْهَرُ لِقُلُوبِكُمْ وَقُلُوبِهِنَّ وَمَا كَانَ لَكُمْ أَن تُؤْذُوا رَسُولَ اللَّهِ وَلَا أَن تَنكِحُوا أَزْوَاجَهُ مِن بَعْدِهِ أَبَدًا إِنَّ ذَلِكُمْ كَانَ عِندَ اللَّهِ عَظِيمًا.

Ey iman gətirənlər! Peyğəmbərin evlərinə sizə yeməyə icazə verilmədən (yeməyə“ dəvət olunmadan) girib onun bişməsini gözləməyin. Lakin dəvət olunduqda gedin və (yeməyinizi) yedikdən sonra (orada bir-birinizlə) söhbətə qapılmayıb dağılın. Bu (sizin çox oturmağınız), Peyğəmbərə əziyyət verir, amma o sizdən (bunu sizə deməkdən) utanırdı. Lakin Allah doğru sözdən çəkinməz. Onlardan (Peyğəmbərin zövcələrindən) bir şey soruşduqda, pərdə arxasından soruşun (evlərinə daxil olmayın). Bu həm sizin, həm də onların ürəklərinə daha çox təmizlik bəxş edər. Sizə Allahın Peyğəmbərini incitmək, özündən sonra onun zövcələri ilə evlənmək əsla yaraşmaz. Həqiqətən, bu, (Allah yanında böyük günahdır!”(۱

Müsəlman ərəblər Peyğəmbəri-Əkrəmin (s) zövcələri evdə olduğu halda, çəkinmədən və icazəsiz



---

.Əhzab”, surəsi, ayə: ۵۳“ [۱]-۱

o həzrətin evinə daxil olurdular. Məhz bu səbəbdən, ayə nazil olaraq onlara bildiriş verdi ki, Peyğəmbəri-Əkrəmin (s) evinə icazsiz daxil olmasınlar, yeməyə də`vət olunduqda, gecikməyin və vaxtında gedin, yeməyinizi yedikdən sonra söhbətə qapılmayıb dağılın və o həzrətin vaxtını bihudə sözlərlə tələf etməyin; çünki belə işlər o ...həzrəti narahat edir, amma sizi evindən qovmağa utanır

.Bu ayə də digər ayələr ki, “hicab” və örpəkdən söz açılır

səh:۱۱۶

## RƏVAYƏTLƏRDƏ HİCAB

:İmam Sadiqdən (ə) nəql olunan bir rəvayətdə buyurulur .١

(حرّم النظر الى شعور النّساء المحجوبات بالأزواج و الى غيرهنّ من النّساء، لما فيه من تهييج الرّجال و ما يدعوا اليه التهييج من الفساد.)

Allah-taala evlənmiş hicablı qadınların və digər qadınların da saçına baxmağı haram“ etmişdir. Çünki kişilərin ehtiraslı baxışı cinsi instinktləri təhrik edir və bu da fəsadla (nəticələnir.”(١

Peyğəmbəri-Əkrəmin (s) zamanında ənsarlı bir cavan Mədinə küçələrinin birində bir .٢ qadınla rastlaşdı. Qadının gözəlliyi onun diqqətini özünə cəlb etdi. Nəhayət, dar bir küçəyə daxil oldu, yol gedə-gedə tez-tez üzünü arxaya çevirib qadına baxırdı ki, birdən başı divara dəydi, divardakı daş və yaxud şüşə parçası onun üzünü yaraladı. Üzündən qan axıb, libasına töküldü. Oğlan elə o halda



---

.Vəsailüş-şiə”, ١۴-cü cild, səh. ١۴٠, hədis: ١٢“ [١]-١

Peyğəmbəri-Əkrəmin (s) hüzuruna gedib, hadisəni danışdı. Bu zaman vəhy mələyi :Cəbrail nazil olub, naməhrəmə baxmağın və hicabın hökmlərini bu ayədə

قُل لِّلْمُؤْمِنِينَ يَغُضُّوا مِنْ أَبْصَارِهِمْ وَيَحْفَظُوا فُرُوجَهُمْ ذَلِكَ أَزْكَى لَهُمْ إِنَّ اللهَ خَبِيرٌ بِمَا يَصْنَعُونَ

Ya Rəsulum!) Mömin kişilərə de ki, gözlərini haram edilmiş şeylərdən çevirsinlər)“ (naməhrəmə baxmasınlar), öz iffətlərini qorusunlar. Bu, onlar üçün daha təmizlik, (pakizəlik sayılır. Şübhəsiz, Allah onların nə etdiklərindən xəbərdardır!” – bəyan etdi.(١)

:İmam Sadiqin (ə) belə buyurduğu nəql olunmuşdur .٣

(النظره سهم من سهام ابليس و كم من نطره أورثت حسره طويله.)

Naməhrəmə) baxmaq İblisin zəhərli oxlarından biridir. Nə çox baxışlar vardır ki, (öz)“ (ardınca) uzun həsrətə səbəb olur.” (٢)

Mə`lum olduğu üzrə, qadına baxmaq kişiyə haramdırsa, qadın da geyiminə elə fikir verməlidir ki, kişilər ona qarşı təhriklənməsin, əks təqdirdə, günaha yardım, yaxud .günaha şərait hazırlamaq ünvanına aid ediləcəkdir

Bir gün Fəzl ibn Abbas adlı gözəl simalı bir cavan Peyğəmbəri-Əkrəmlə (s) birgə bir .۴ miniyə minib, hərəkət edirdilər. Xəsəmiyyə qəbiləsindən bir qadın o həzrətin yanına gəlib, sual soruşduğu zaman Fəzlə baxır, Fəzl də ona baxırdı. Bunu müşahidə edən Peyğəmbər (s) əli ilə Fəzlin üzünü çevirdi və əməli olaraq iki naməhrəmin



---

.Vəsailüş-şiə”, ٧-ci cild, səh. ١٣٩“ [١]-١

.Yenə orada, səh. ١٣٨ [٢]-٢

(bir-birinə baxmağını qadağan etdi.(١)

Bir rəvayətdə buyurulur ki, Ümmü Məktum m Peyğəmbəri-Əkrəmdən (s) o həzrətin .۵ otağına daxil olmaq üçün icazə istədi. Aişə ilə Həfsə o həzrətin yanında idi. Həzrət onlara buyurdu: "Ayağa qalxın və içəri otağa daxil olun." Onlar dedilər: "O ki, görmür!" "!Həzrət buyurdu: "O, sizi görməsə də, siz onu görürsünüz

:İmam Sadiqdən (ə) nəql olunan hədisdə buyurulur .۶

(و كان امير المؤمنين (عليه السـلام) يسلّم على النّساء و كان يكره ان يسلّم على الشّابه منهنّ و يقول: اتخوّف ان يعجبنى صوتها فيـدخل عليّ اكثر ممّا طلبت من الأجر، ثمّ قال: انّما قال ذلك لغيره و ان عبّر عن نفسه. و اراد بـذلك ايضا التخوّف من ان يظنّ به ظانّ ان يعجبه صوتها فيكفر.)

İmam Əmirəlmö`minin Əli (ə) (yaşlı) qadınlara salam versə də, cavan qızlara salam" verməyi bəyənmir və (səbəbi haqda) belə buyururdu: "Qorxuram ki, onların səsi xoşuma gəlsin və beləcə, mənə salam verməkdən gözlədiyim savabdan daha çox zərər yetişsin." Bu zaman imam Sadiq (ə) buyurdu: "Əlbəttə, Həzrət bu sözləri özünə aid etsə də, başqaları üçün buyurmuşdur." Həmçinin o həzrət buyurmuşdur: "Naməhrəmin səsinin mənə tə`sir edəcəyindən və başqasının naməhrəmin səsinin (mənə xoş gəldiyini güman edərək kafir olacağından qorxuram!"(٢)

:İmam Sadiq (ə) Peyğəmbəri-Əkrəmdən (s) belə nəql etmişdir .٧

(نهى ان تزيّن المرأه لغير زوجها، فان فعلت كان حقّا على الله ان يحرقها



---

."Səhihi-Büxari" [١] -١

.Vəsailüş-şiə", ٧-ci cild, səh. ١٧۴" [٢] -٢

بالنّار.)

Peyğəmbəri-Əkrəm (s) qadının yad bir kişiyə görə zinətlənməsini qadağan etmişdir.“ (Əgər qadın belə bir iş görsə, Allahın onu cəhənnəmdə yandırması gərəkdir.”(١)

:İmam Sadiqin (ə) belə buyurduğu nəql olunmuşdur .٨

(اخذ رسول الله على النّساء ان لا ينحن و لا يخمشن و لا يقعدن مع الرّجال فى الخلاء.)

Peyğəmbəri-Əkrəm (s) qadınlardan əhd-peyman aldı ki, növhə oxuyub, üzlərini“ (cırmasınlar və kişilərlə xəlvətə çəkilməsinlər.”(٢)

Peyğəmbəri-Əkrəm (s) “Qadınlar üçün hər bir şeydən yaxşı nədir?” - deyə . ٩ soruşduqda, xanım Fatimeyi-Zəhra (ə.s) belə cavab verdi: “Qadın üçün ən gözəl və yaxşı əməl odur ki, nə naməhrəm bir kişi onu görsün, nə də o, naməhrəm bir kişini görsün.” Peyğəmbəri-Əkrəm (s) bu zaman buyurdu: “Bu xanədan bir ağacdan və (Fatimə məndəndir.”(٣)

:İmam Əmirəlmö`minin Əlinin (ə) belə buyurduğu nəql olunmuşdur .١٠

(يا اهل العراق! نبّئت ان نساءكم يدافعن الرّجال فى الطريق اما تستحيون؟ و فى روايه: لعن الله من لا يغار. و فى حديث آخر:اما تستحيون و لا تغارون، نساءكم يخرجن الى الأسواق و يزاحمن العلوج.)

Ey İraq əhli! Eşitmişəm ki, qadınlarınız yol gedərkən çiyinlərini (yolu açmaq üçün)“ kişilərin



---

.Vəsailüş-şiə”, ٧-ci cild, səh. ١٥۴“ [١]-١
.Məkarimül-əxlaq”, səh. ٢٢٣“ [٢]-٢
.Biharül-ənvar”, ۴٣-cü cild, səh. ٨۴“ [٣]-٣

çiyinlərinə vururlar! Heç həya etmirsiniz, utanmırsınız?!" Başqa bir rəvayətdə isə belə buyurmuşdur: "Allah qeyrətsiz şəxsə lə`nət etsin!" Yenə başqa bir rəvayətdə belə buyurmuşdur: "Nə üçün həya edib, qeyrətə gəlmirsiniz? Halbuki qadınlarınız bazara gedib, çirkin kişilərlə əlaqə saxlayır!"(١)

١١. Ümmü Sələmədən belə nəql olunmuşdur:

يَا أَيُّهَا النَّبِيُّ قُل لِّأَزْوَاجِكَ وَبَنَاتِكَ وَنِسَاء الْمُؤْمِنِينَ يُدْنِينَ عَلَيْهِنَّ مِن جَلَابِيبِهِنَّ ذَلِكَ أَدْنَى أَن يُعْرَفْنَ فَلَا يُؤْذَيْنَ وَكَانَ اللَّهُ غَفُورًا رَّحِيمًا

"Ya Peyğəmbər! Zövcələrinə, qızlarına və möminlərin övrətlərinə de ki, (evdən çıxdıqda cariyələrə oxşamasınlar deyə, bədənlərini başdan-ayağa gizlədən) çarşablarını örtsünlər. Bu onların tanınması (cariyə deyil, azad qadın olduqlarının bilinməsi) və onlara əziyyət verilməməsi üçün daha münasibdir." - ayəsi nazil olduqdan sonra ənsarlı qadınlar evdən çölə çıxdıqda, başında qara qarğa əyləşmiş kimi, qara çarşablarını örtürdülər.(٢)

١٢. Bəni-Təmim qadınlarından bir qrupu əyinlərinə nazik paltar geyindikləri halda, Ayişənin yanına getdilər. Ayişə onları görcək dedi: "Əgər imanlı qadın olsaydınız, belə geyinməzdiniz. Bu geyim mö`minə qadınlara yaraşmaz. Əgər imanınız yoxdursa, istədiyinizi geyinə bilərsiniz."(٣)

١٣. Peyğəmbəri-Əkrəmdən (s) belə nəql olunmuşdur:

(كان ابى ابراهيم غيوراً و أنا اغير منه و ارغم الله انف مَن لا يغار من المؤمنين.)

səh:١٢١

---

١- [١] "Vəsailüş-şiə", ٧-ci cild, səh. ١٧۴.

٢- [٢] "Təfsiri-İbn Kəsir", ٣-cü cild, səh. ۵١٨.

٣- [٣] "Təfsiri-Qurtubi", "cilbab" ayəsinin təfsiri.

İbrahimin atası qeyrətli idi, mən isə ondan da qeyrətliyəm. Allah mö`minlərdən“ (qeyrətsiz olan kəsin burnunu torpağa sürtsün!”(۱)

:İmam Əmirəlmö`minin Əli (ə) imam Həsənə (ə) vəsiyyətində belə buyurmuşdur .۱۴

(...و اكفف عليهنّ من ابصارهنّ بحجابك، فانّ شدّه الحجاب ابقى عليهنّ، و ليس خروجهنّ بأشدّ من ادخالك من لا يوثق به عليهنّ و ان استطعت ان لا يعرفن غيرك فافعل.)

Qadınlarını hicablı saxlamaqla baxışlarını azalt, çünki kamil hicab onların iffətinin...“ qorunmasında böyük tə`sirlidir. Onların evdən çölə çıxmaqlarının təhlükəsi evinə e`timadsız bir şəxsi gətirməkdən az deyildir. Əgər bacarsan, elə et ki, səndən (başqasını tanımasın!”(۲)

:İmam Sadiq (ə) buyurmuşdur .۱۵

(اذا لم يغير الرجل فهو منكوس القلب.)

(Qeyrəti olmayan şəxsin qəlbi dönmüşdür.”(۳“

səh:۱۲۲

---

.Vəsailüş-şiə”, ۷-ci cild, səh. ۱۰۸“ [۱] -۱
.Nəhcül-bəlağə”, məktub: ۳۳“ [۲] -۲
.Vəsailüş-şiə”, ۷-ci cild, səh. ۱۰۸“ [۳] -۳

## ƏHLİ–BEYTİN HİCABA MÜNASİBƏTİ

**İşarə**

Tarixə müraciət etdikdə, görürük ki, həzrət Peyğəmbəri-Əkrəmin (s) Əhli-beyti (ə) hicaba böyük əhəmiyyət vermiş və ən çətin şəraitdə belə, ona riayət etmişlər. :Aşağıdakı nümunələr buna canlı şahiddir

### :a) Həzrət Fatimeyi–Zəhranın (ə.s) hicaba əhəmiyyət verməsi

**İşarə**

Həzrət Fatimeyi-Zəhra (ə.s) İslam hicabı və geyiminə böyük əhəmiyyətlə yanaşmış və mə`sum olduğundan, bu məslədə bütün müsəlman qadınlara ən yaxşı örnək və nümunədir. Burada o həzrətin hicabla bağlı rəftarına bir neçə nümunəyə diqqət :yetirək

١

**:Evdən çölə çıxanda məqnəə örtmək .١**

Həzrət Fatimeyi-Zəhra (ə.s) Əbu Bəkr və camaatla söhbət etmək üçün məscidə .gedərkən başına məqnəə çəkmişdi

səh:١٢٣

:Bir rəvayətdə belə buyurulur

(انّه لمّا اجمع ابوبكر و عمر على منع فاطمه فدكاً و بلغها ذلك لاثت خمارها على رأسها.)

Əbu Bəkrlə Ömər Fatiməni “Fədək”dən məhrum etmək qərarına gəldikdə və bu xəbər“ (o həzrətə çatdıqda, məqnəəsini başına çəkdi.”(١

:Təbərsi öz silsilə sənədləri ilə imam Əbu Cə`fərin belə buyurduğunu nəql edir

(فاطمه سيده نساء اهل الجنّه، و ما كان خمارها الّا هكذا: و اومأ بيده الى وسط عضده.)

Fatimə behişt qadınlarının sərvəridir və onun məqnəəsi belə idi: İmam əli ilə“ (musqulunun yarısına qədər işarə etdi.”(٢

### :Çarşaba bürünmək .٢

(و اشتملت بجلبابها) ,Həzrət Fatimeyi-Zəhra (ə.s) xütbə söyləmək üçün məscidə gedərkən (özünü başdan-ayağa çarşabı ilə örtmüşdü.”(٣“

### :Çarşabının uzun biçmək .٣

Həzrət Fatimeyi-Zəhra (ə.s) çarşabını uzun biçərdi və hətta ayaqlarını belə örtərdi. :Hədisdə belə buyurulur

تطأ ذيولها

O həzrət çarşabını ayaqlarının altına qədər“



---

.Ehticac”, Təbərsi, “Həzrət Fatimeyi-Zəhranın (ə.s) ehticacları” bölümü“ [١]-١

.Biharül-ənvar”, ۴٣-cü cild, səh. ٩١, hədis: ١۶“ [٢]-٢

.Yenə orada [٣]-٣

(biçərdi."(١

### :Özünü başqalarının gözündən gizli saxlamaq .۴

Həzrət Fatimeyi-Zəhra (ə.s) öz qövmünün, eləcə də işgüzar qadınlarının arasında :hərəkət edirdi ki, kimsə onu görməsin və tanınmasın. Hədisdə belə göstərilir

(و اقبلت فی لمّه من حفدتها و نساء قومها.)

(İşgüzar, eləcə də öz qövmünün qadınlarının arasında hərəkət edirdi."(٢"

## :b) İmam Hüseynin (ə) əhli-əyalının hicaba yüksək əhəmiyyət verməsi

### İşarə

Aşura" qəhrəmanlığında qadınların bariz cilvələrindən biri də ilahi hökmlərə, xüsusilə" iffət və hicab məsələsinə iltizamlı olmaları və onlara riayət etmələri idi. İmam Hüseynin (ə) Əhli-beyti Kərbəla səfərində iffət və mətanət carçıları idi. Bu haqda bir :neçə nümunəyə diqqət yetirək

### :Həzrət Ümmü Külsümün (ə.s) hicaba əhəmiyyətlə yanaşması .١

İmam Əmirəlmö`minin Əlinin (ə) qızı həzrət Ümmü Külsüm (ə.s) əsirlər Kufəyə daxil olarkən böyük cəmiyyət qarşısında çıxış edib, onları imam Hüseynə (ə) yardım etməmələri və bu işdə səhlənkarlığa yol vermələri üçün məzəmmət etdi. Camaat Kufənin



---

.Yenə orada [١]-١

.Yenə orada [٢]-٢

girişində onlara tamaşa etmək üçün bir yerə toplaşmışdılar. Həzrət Ümmü Külsüm :(ə.s) onların başına fəryad çəkib buyurdu

(يا اهل الكوفه! اما تستحيون من الله و رسوله ان تنطروا الى حرم النّبى (ص).)

Ey Kufə əhli! Allah və Peyğəmbərindən utanmırsınızmı ki, Peyğəmbərin (s) Əhli-“ (beytinə baxırsınız?!”(١)

Həmçinin imam Hüseynin (ə) Əhli-beyti Şama daxil olduqda da, həzrət Ümmü Külsüm (ə.s) Şümrü (Allah ona lə`nət etsin!) çağırdı ki, onları az camaat olan darvazadan keçirsin, şəhidlərin pak başlarını camaatın gözündən uzaq saxlasın və camaat Peyğəmbərin (s) Əhli-beytinin (ə) çöhrəsinə tamaşa edə bilməsinlər. Şümr isə dinsizliyini və xəbisliyini bildirmək üçün o xanımın istəyinə əks rəftar etdi və əsirləri (Şamın böyük darvazasından və camaatın gözü önündə apardı.(٢)

### :Həzrət Səkinənin (ə.s) hicaba əhəmiyyətlə yanaşması .٢

Səhl ibn Sə`d əsirlərin Peyğəmbər (s) Əhli-beytindən olduğunu bildikdə, irəli gedib, onların birindən “Sən kimsən?” - soruşduqda, “Mən imam Hüseynin (ə) qızı Səkinəyəm!” - deyə cavab verdi. O soruşdu: “Bir şeyə ehtiyacın varmı? Mən cəddin



---

.Məqtəlül-Hüseyn (ə)”, Müqərrəm, səh. ۴٠٠“ [١]-١

.Yenə orada, səh. ۴٢۴ [٢]-٢

Peyğəmbərin (s) səhabəsi Səhləm.” Həzrət Səkinə (ə.s) buyurdu: “Nizədə bu başı aparan şəxsə de ki, bizdən irəli hərəkət etsin ki, camaat ona tamaşa etməklə Peyğəmbəri-Əkrəmin (s) xanədanına göz dikməkdən yayınsınlar.” Səhl sür`ətlə irəli gedib, nizəçiyə dörd yüz dirhəm pul verdikdə, o da imam Hüseynin (ə) kəsilmiş pak başını qadınlardan uzaqlaşdırdı.(۱)

### ۳. Həzrət Zeynəbin (ə.s) hicaba əhəmiyyətlə yanaşması:

Həzrət Zeynəb (ə.s) Yezidin sarayındakı rüsvayedici xütbəsində belə buyurdu:

(أمن العدل يابن الطلقاء تخديرك و امائك و سوقك بنات رسول الله سبايا، قد هتكت ستورهن و ابديت وجوهن، تحدو بهن الاعداء من بلد الى بلد و يستشرفهنّ اهل المناهل و المعاقل و يتصفّح وجوهنّ القريب و البعيد.)

“...Ey Yezid! Elə güman edirsən ki, bizi əsirlər kimi şəhərbəşəhər dolandırmağın bizə zillət və xar, sənə isə izzət və kəramətdir?!... Ey Məkkənin fəthində azad olunmuşun oğlu! Öz qadın və kənizlərini pərdə arxasında yerləşdirməyin, Peyğəmbəri-Əkrəmin (s) qızlarını isə əsirlər kimi dolandırıb, onlara qarşı hörmətsizliyin, üzlərini açmağın, düşmənləri onlara hakim etməklə şəhərbəşəhər dolandırmağın ədalətdirmi? Axı, şəhər, kənd, qala və səhrada yaşayanlar onlara



---

۱- [۱] “Həyatül-imamil-Hüseyn (ə)”, ۳-cü cild, səh. ۳۷۰.

(baxır, uzaq və yaxından hamı onların üzünə tamaşa edirdilər?!..."(۱)



---

۱- [۱] Yenə orada.

## Haqqında mərkəzi

Allahın adı ilə

Rəhman və Rəhimli olan Allahın adı ilə.Və bütün həmdlər aləmlərin rəbbi olan Allaha .məxsusdur

.Varlıq aləminin Kövsəri olan Həzrəti Fatiməyi Zəhraya (a) təqdim olunur

(Bilən kimsələrlə (alimlər) bilməyənlər (cahillər) eynidirlərmi? (Zümər sürəsi, ayə ۹

:Ön söz

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi ۲۰۰۶-cı ildən Mərhum Ayətullah Seyyid Həsən Fəqih İmaminin nəzarəti altında,elmi mərkəzlərdə tanınan görkəmli tələbələrin vasitəsi ilə məzhəb,mədəniyyət və elmi sahələrdə öz fəaliyyətinə .başlamışdır

:Məramnamə

İsfahan Qaimiyyə kompüter araşdırmalar müəssisəsi təhqiqatçıların dini biliklərə rahət və tez bir zamanda yiyələnmələri üçün hər bir xidməti onların ixtiyarında qərar vermişdir.Və bu sahədə təəssübkeşlikdən,ictimai,siyasi,fərdi cəryanlardan uzaq duraraq yalnız və yalnız elmi sahədə ixlasla öz xidmətini həyata keçirməkdədir.Bu səbəbdən adı çəkilən müəssisə layihəsini həyata keçirmiş.Və tədqiqat üçün nəzərdə tutulmuş kitabları,məqalələri mütəxəssislər və müxtəlif təbəqələrdən olan insanlar üçün,bir neçə dillərdə və formalarda hazırlayaraq,heç bir məbləğ tələb etmədən sosial .medyada istifadəçilərin ixtiyarında qoymuşdur

:Hədəflər

Quran və Əhli beyt mədəniyyətini və maarifini yaymaq.۱

İnsanları,xüsusən gəncləri tam dəqiq şəkildə dini məsələləri araşdırmağa.۲ sövqləndirmək

Telefon,tablet və kompüterlərdə olan faydasız,yararsız mövzuların yerini .۳ faydalı,mənəviyyatlı mövzularla doldurmaq

.Təhqiqatla məşğul olan tələbələrə xidmət etmək.۴

.Kitab və elmi əsərlər oxumaq mədəniyyətini yaymaq.۵

.Müəlliflərin öz elmi əsərlərini digital formada yaymaq üçün onlara şərait yaratmaq.۶

:İcraçılıq

.Qanunla icazəli olan lisenziyaya malik əsərlərin yayımı.۱

.Bu mərkəz kimi xidmət göstərən oxşar mərkəzlərlə əlaqə.۲

.(Paralel xidmətlərdən çəkinmək (başqalarının etdiklərini təkrarlamamaq.۳

.Yalnız və yalnız elmi məsələləri yaymaq.۴

.Nəşriyyatın mənbələrini qeyd etmək.۵

.Qeyd:Kitabda olanlara görə məsüliyyət o kitabı yazan müəllifin öhdəsindədir

:Müəssisənin fəaliyyəti

.Kitabların çapı və nəşri.۱

.Kitab oxumaq müsabiqələrinin təşkili.۲

.Məcazi sərgilərin istehsalı.۳

.Kompüter oyunlarının istehsalı.۴

Qaimiyyə internet saytının yaradılması:www.ghaemiyeh.com.۵

.Sərgi məhsullarının və moizələrin istehsalı.۶

.Şər'i,əxlaqi və etiqadi suallara cavab.۷

.Mühasibat,mətbuat yaratmaq və sms... sistemlərinin layihəsi.۸

.Təlim kurslarının həyata keçirilməsi.۹

Tərbiyəçi şəxslər hazırlamaq üçün təlim kurslarının təşkili.۱۰

Kompüterdə,tabletdə və telefonlarda icrası mümkün olan minlərlə proqramların.۱۱ dünyada məşhur olan səkkiz formada istehsalı

JAVA.۱

ANDROID.۲

EPUB.۳

CHM.۴

PDF.۵

HTML.۶

CHM.۷

GHB.۸

.v.Qaimiyyə kitab bazarı adına dörd market

ANDROID.۱

IOS.۲

WINDOWS PHONE.۳

WINDOWS.۴

deyilənlər müəssisənin veb saytında Fars,Ərəb,İngilis və Azərbaycan dillərində pulsuz

.istifadəyə verilmişdir

:Sonunda

Mərcəi təqlid müctəhidlərin dəftərxanalarından (ofis),müəssisələrdən,nəşriyyatçılardan,müəlliflərdən və əməyi olan bütün şəxsiyyətlərdən bizlərə hədəfə çatmaqdan ötrü yardım etdikləri üçün səmimi qəlbdən .təşəkkür edirik

:Mərkəzin ünvanı

İsfahan-Əbdurrəzzaq küçəsi-Hacı Muhəmməd Cəfər adına bazar-Şəhid Muhəmməd Həsən Təvəkküli küçəsi-blok۱۲۹/۳۴-birinci mərtəbə

veb sayt:www.ghbook.ir

mail:Info@ghbook.ir

mərkəzin ofis telefonu: ۰۰۹۸۳۱۳۴۴۹۰۱۲۵

Tehran ofisi: ۰۰۹۸۲۱۸۸۳۱۸۷۲۲

Biznes və alqı satqı: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹

Mərkəzdə çalışan insanlarla əlaqə yaratmaq üçün nəzərdə tutulan nömrə: ۰۰۹۸۹۱۳۲۰۰۰۱۰۹